# MÜNDƏRİCAT

## Ön söz.

Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvab monoqrafiyası Qarabağda ədəbi mühitin yaranması və bu prosesdə Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" əsərinin oynadığı rol işıqlandırılmışdır. Ədalət naminə demək lazımdır ki, monoqrafiyada ilk dəfə olaraq M.M.Nəvvabın Qarabağ ədəbi mühitində yeri və "Məclisi-fəramuşan"ın oynadığı rol elmi şəkildə təhlil edilərək ümumiləşdirilmiş və düzgün qiymətləndirilmişdir. Müəllif Ə. Əliyev monoqrafiyada faktlar əsasında sübut edir ki, Qarabağ ədəbi mühitinin təşəkkülü və formalaşmasında M. M. Nəvvabın müstəsna dərəcədə rolu olmuşdur.

Monoqrafiyada M. M. Nəvvabın yaşadığı mühit onun maarifçilik fəaliyyəti əhatəli, hərtərəfli izah olunmuş və əsas məqamlar daha qabarıq şəkildə diqqətə çatdırılmışdır.

Monoqrafiyanın III fəsli "Təzkireyi-Nəvvab" əsərinin təhlilinə həsr edilmişdir. Müəllif bu fəsildə M. M. Nəvvabın sələfləri, müasirləri haqqındakı fikirlərini verdiyi məlumatlar əsasında şərh etmiş və bu nəticəyə gəlmişdir ki, verilən məlumatlar ensiklopedik xarakterdə olub. Qarabağ ziyalıları, şairləri haqqında ən düzgün məlumatlardır və bir məxəz kimi ondan istifadə etmək olar. Ümumiyyətlə, M. M. Nəvvabın bu əsəri Azərbaycan xalqının yüz illər boyu yaratdığı mənəviyyatı, mədəniyyəti, həyat tərzi, adət-ənənələri haqqında zəngin məlumat verən əsas qaynaqlardan biridir. Monoqrafiyada M.M.Nəvvabın təhsil sahəsindəki (müəllimlik) fəaliyyəti, musiqi sahəsində gördüyü işlər, bir şair kimi yaradıcılığı dərindən araşdırılmış, onun mövzu istiqamətləri müəyyənləşdirilmiş və obyektiv şəkildə təhlil edilərək dəyərləndirilmişdir.

Monoqrafiya olduqca faydalı və Qarabağ tariximizi öyrənmək baxımından dəyərli bir tədqiqat əsəridir.

**"İbtidai və məktəbəqədər təhsilin metodikası"**
**kafedrasının müdiri:**
***M.M.Həsənov. Əməkdar müəllim, professor***

# GİRİŞ

Yaradıcı şəxslərin təşkilatlanmasına və eyni zamanda bədii fikrin inkişafına ciddi təsir göstərən ədəbi mühitlərin öyrənilməsi kifayət qədər aktual olan problemlərdəndir. Onların fəaliyyət dairəsi məhəlli xarakterdə olmamış, Azərbaycan ədəbiyyatının zənginləşməsinə xidmət göstərmişdir. Bu istiqamətdə bir-birindən maraqlı olan araşdırmalar ədəbi mühitlərin ictimai-siyasi düşüncədə, ədəbi-nəzəri fikirdə tutduqları yeri müəyyənləşdirməyə yönəlmişdir. Dünya xalqlarının ədəbiyyatında olduğu kimi, Azərbaycan ədəbiyyatını da ədəbi mühitlərsiz təsəvvür etmək mümkün deyildir. Məsələn, min illik ədəbiyyat və sənət tariximizi Şirvanşahlar, Atabəylər saray mühitindən təcriddə öyrənmək ədəbi-elmi təfəkkürün qəbahətindən başqa bir şey ola bilməz. Şərqdə bunun daha əski çağlara gedib çıxacaq tarixi var. VII-VIII əsrlərdəki Məkkə, Mədinə, Bağdad, Şam və s. mühitləri özünün böyük ənənələri ilə sonrakı çağların mədəni həyatına həmişə təsirdə olmuşdur.

Əgər Şirvanşahlar mühitində Əbül-Üla Gəncəvi, Xaqani Şirvani, Izzəddin Şirvani, Fələki Şirvani kimi böyük şəxsiyyətlər formalaşmışsa, saraydan kənarda olsalar da, Atabəylər mühitində Qivami Mütərrizi, Nizami Gəncəvi kimi sənətkarlar böyük inkişaf yolu keçmiş və daha geniş miqyasda tanınmışlar. Qəznəvilər mühitində də eyni hal nəzərə çarpır. Ənvəri, Ğayiri, Firdovsi, Sənai yaradıcılığı buna nümunədir.

XVIII-XIX əsrlərdə mövcud olan Qarabağ ədəbi mühiti də həmin ənənənin davamıdır. Qarabağ ədəbi mühitinin, o cümlədən M.M.Nəvvabın «Təzkireyi-Nəvvab» əsərinin öyrənilməsi tarixi ənənənin yeni bir mərhələdə hansı

formada və hansı məzmunda ortaya çıxmasının əhəmiyyətini göstərmək baxımından vacib və zəruridir.

Bu mövzunun aktuallığının ikinci tərəfində son dövrün olayları dayanır. Çünki yaxın onillikdə baş verənlər tarixi reallığın ortaya qoyulmasını, müxtəlif istiqamətli araşdırmaların aparılmasını zəruri edir. Ictimai, siyasi, etnoqrafik, tarixi, ədəbi materialların, faktların aşkarlanmasına indi yeni səpkidə yanaşma daha vacib və daha zəruridir.

XVIII-XIX əsr Qarabağ ədəbi mühitinin öyrənilməsi bir sıra ədəbi şəxsiyyətlərin də həyat və yaradıcılığının qaranlıq və gizli qalan tərəflərinin aşkarlanması deməkdir. Həmin şəxsiyyətlərdən biri Mir Möhsün Nəvvabdır. (1833-1919) M.M.Nəvvab XIX əsr Qarabağ ədəbi mühitinin ən qüdrətli nümayəndələrindəndir. Görkəmli ədəbiyyatşünas F.Köçərli bu mühiti xarakterizə edərək yazır: «Şuşa şəhərinin ab-havasının təsirindən və torpağının bərəkətindən burada çox zürəfa, üdəba və şüəra vücuda gəlibdir. Belə ki, Şuşa qalası Zaqafqaziyanın Şirazı mənzələsində olub, ərbabi-zövqü səfa oymağı və əhli-hal və sahibi-dil yatağı hesab olunur» (75. s.157).

Bu məsələnin bir tərəfidir. Onun digər tərəfində Qarabağ xanlığının formalaşması və M.P.Vaqifin bu mühitdə müqtədirliyi dayanır. Həmin ənənə davamlı olaraq sonrakı əsrlərə ötürülür və XIX və XX əsrlərdə müxtəlif səpgili mədəniyyət faktları ilə yaşanır. M.P.Vaqifdən Qasım bəy Zakirə, Aşıq Pəriyə, Məhəmməd bəy Aşiqə, Xurşidbanu Natəvana, Seyid Nigariyə və son olaraq Mir Möhsün Nəvvaba böyük bir yol uzanır. Bu yolda M.M.Nəvvab böyük zəka sahibi kimi bir çox yaradıcılıq sahələrini özündə birləşdirmişdir. Məhz ona görə də Mir Möhsün

Nəvvabı Qarabağ ədəbi mühiti kontekstində bir neçə istiqamətdə araşdırmağın zəruriliyi yaranır.

Mir Möhsün Seyid Əhməd oğlu Nəvvab Ağamirzadə Qarabaği Azərbaycan ədəbi-nəzəri fikrində görkəmli yazıçı, alim, şair, rəssam, musiqişünas, pedaqoq, xəttat, astronom, nəqqaş, təzkirəçi kimi böyük şöhrət qazanmışdır. Bizim tədqiqatımızın ümumi mahiyyətində M.M.Nəvvabın çoxtərəfli yaradıcılığının bir istiqaməti də Qarabağ ədəbi mühiti kontekstində təzkirəçilik bacarığıdır ki, bu da birbaşa Mir Möhsün Nəvvabın ədəbiyyatşünaslıq fəaliyyəti ilə bağlıdır. Məhz mövzunun aktuallığını şərtləndirən cəhətlərdən biri də budur. Bütövlükdə təzkirəçilik müstəvisində, türk təzkirə ənənəsində, son olaraq XIX əsrdə yaranan ədəbi məclislər baxımından Mir Möhsün Nəvvabın öyrənilməyə daha çox ehtiyacı və haqqı var. Bunlar özlüyündə Azərbaycan ədəbiyyatının bir sıra qaranlıq məqamlarına işıq salır. Eyni zamanda XIX əsr Azərbaycan ədəbiyyatının hansı ideallarla yaşamasını da səciyyələndirir.

Qarabağ ədəbi mühiti ilə bağlı müxtəlif istiqamətli əsərlər yazılıb. Bu mühitin ayrı-ayrı nümayəndələri ilə bağlı bir sıra maraqlı araşdırmalar aparılıb. M.P. Vaqifin, Q.Zakirin, X.Natəvanın, C.Nəvanın, M.Aşiqin, K.S.Valehin və başqalarının yaradıcılığını əks etdirəcək müxtəlif istiqamətli tədqiqat əsərləri (40; 171; 20; 75; 81;) yazılıb. Lakin o böyük mühitin zənginliyi müqabilində görülənlər çox azdır. Görkəmli ədəbiyyatşünas F.Köçərlidən (75, 76) başlayan bu yol F.Qasımzadə (82), A.Dadaşzadə (40), N.Axundov (10), Z.Səfərova (141), B.Məmmədov (100), M.X.Axundov (9), M.Allahmanlı (17, 20), A.Topalova (159), A.Hacıyeva (61) və başqaları tərəfindən müxtəlif səviyyələrdə davam etdirilib. Həmin tədqiqatlar bütövlükdə

XVIII-XIX əsr Qarabağ ədəbi mühitinin müxtəlif problemlərinə yönəlib.

Mir Möhsün Nəvvabın da rəngarəng yaradıcılığı bu sıradadır. 1925-ci ildən başlayaraq məqalə, monoqrafiya, dissertasiya səviyyəsində pedaqoji görüşləri, musiqi nəzəriyyəsinə dair yaradıcılığı istisna olunmaqla, Mir Möhsün Nəvvab əsərləri ümumi şəkildə toxunulub. Lakin bu sahədə S.Mümtaz (114), F.Köçərli (75, 76), F.Qasımzadə (82), F.Şuşinski (148, 152), N.Axundov (16), N.Qarayev (79), H.Orucəli (136), Y.Talıbov (157), A.Hacıyeva (61), T.Kərimli (67) və başqaları müəyyən problemlər ətrafında M.M.Nəvvabın yaradıcılığına yer veriblər. Müxtəlif vaxtlarda M.Möhsün Nəvvabın əsərlərinin çapı olub. Hətta 150 illik yubileyi münasibətilə bir sıra dəyərli işlər görülüb. «Təzkireyi-Nəvvab» (130) əsəri çap edilib. Lakin onun bu təzkirəsinin Qarabağ ədəbi mühiti kontekstində öyrənilməsinə elə də diqqət yetirilməyib. Daha doğrusu, məqalə səviyyəsindən irəli gedilməyib.

M.M.Nəvvabın zəngin irsinin tədqiq edilməsi bir neçə istiqamətdə araşdırma obyektinə çevrilmişdir. Həmin istiqamətlərdən biri M.M.Nəvvabın Azərbaycan ədəbiyyatında rolu və ədəbi-bədii yaradıcılığının tədqiqi ilə bağlıdır. Bu sahədə F.Köçərli, M.Tərbiyət, S.Mümtaz, F.Qasımzadə, K.Talıbzadə, M.Ibrahimov, B.Nəbiyev, K.Məmmədov, N.Axundov, N.Quliyev, həmçinin N.Qarayev, A.Qazıyev, R.Kərimov, O.Həsənov, A.Hacıyeva və s. alimlərimizin əməyi təqdirəlayiqdir.

M.M.Nəvvabın musiqi nəzəriyəsi və ümumiyyətlə musiqi sahəsinə aid fəaliyyəti ilə bağlı dahi bəstəkarımız Ü.Hacıbəyov, Ə.Bədəlbəyli, N.Mirzəyeva, F.Şuşinski, Z.Səfərova, V.Məmmədov, R.Zöhrabov, F.Sadıqov,

M.Müsəddiq, G.Şamilli və başqa tədqiqatçılar öz dəyərli fikirlərini söyləmiş və Nəvvaba yüksək qiymət vermişlər.

M.M.Nəvvabı bir tarixçi kimi tədqiq edən və onun Qarabağşünaslıq tarixi elmi sahəsində xidmətlərini aşkarlayan alimlərimizdən T.Bünyadov, Ə.Hüseynzadə, X.Xəlilov, N.Axundov və b. qeyd edə bilərik.

M.M.Nəvvabın elmi fəaliyyətinin bu və ya digər cəhətlərini tədqiqata cəlb edən və oxuculara çatdıran dos. Y.Ağayev, A.Tağıyev olmuşdur.

Professor A.Xələfov, H.Həsənov, Ə.Nəcəfov və başqaları Nəvvabın kitabxanaçılıq fəaliyyətini tədqiq etmişlər.

M.M.Nəvvabın pedaqoji fəaliyyəti yönümündə tədqiqat aparan professor Z.Göyüşov, professor X.Fətəliyev, professor Y.R.Talıbov, professor F.B.Sadıqov və S.M.Quliyev, dosent A.Tağıyev, p.e.n.T.Kərimli və s. alimlərimizin əməyi diqqətəlayiqdir.

Yaxın zamanlarda M.M.Nəvvab irsini tədqiq edən gənc alim A.Hacıyevanın da əməyi çox önəmlidir. Onun «Mir Möhsün Nəvvabın ədəbi-bədii irsi» adlı əsəri ən sanballı tədqiqatlardandır. Əsərdə M.M.Nəvvab irsinin tədqiqat tarixi elmi araşdırma baxımından lazımınca öz əksini tapmışdır. Müəllif M.M.Nəvvabın ədəbi-bədii irsini, elmi yaradıcılığını, maarifçilik ideyalarını, etik-estetik görüşlərini, lirikasını, ədəbiyyatşünaslıq sahəçndəki xidmətlərini və təşkilatçılıq fəaliyyətini ümumi yanaşma prizmasından öyrənmişdir. «Təzkireyi-Nəvvab»ın nöqsanlı cəhətləri sadalanmış və bu cəhətlər əsərin nəticəsində də ön plana çəkilmişdir.

Əsərdə müəllif «Təzkireyi-Nəvvab»a ümumi kontekstdən yanaşmış və təzkirənin məhəlli xarakter daşıdığını, sistemsiz tərtib olunduğunu qeyd etmişdir. Ona görə də

«Təzkireyi-Nəvvab»a Qarabağ ədəbi mühiti kontekstindən yanaşıb tədqiqata cəlb etmək zərurəti yaranır.

Qeyd etdiyimiz tədqiqatlar M.M.Nəvvabı öyrənməkdə nə qədər əhəmiyyətli olsa da, onun Qarabağ ədəbi mühiti müstəvisində təzkirəçilik fəaliyyətini aşkarlamayır. Bütün bunlar bu monoqrafiyanın hazırlanması üçün zəmin yaradır.

# I FƏSİL

# QARABAĞ ƏDƏBİ MÜHİTİNİN TƏŞƏKKÜLÜ VƏ İNKİŞAF İSTİQAMƏTLƏRİ

## 1.1. Qarabağ ədəbi mühitinin təşəkkülü və formalaşması

Azərbaycan ədəbiyyatının inkişaf tarixinə nəzər saldıqda ən mühüm istiqamətlərdən birini ədəbi mühitlərin təşəkkülü və formalaşması təşkil edir. Bunu türk şeir tarixindəki təkyələr, ocaqlar, saray mühitləri, ədəbi məclislər aydınlıqla göstərir.

Qeyd etmək yerinə düşər ki, mühit anlamında saraylar da ədəbiyyatın inkişafı üçün kifayət qədər böyük rol oynayıb. Azərbaycan ədəbi-nəzəri fikrində Şirvanşahlar, Atabəylər sarayı ilə bağlı bir-birindən maraqlı mülahizələr var. Qəznəvilər sarayı da bu sıradadır. Onların Şərq mədəniyyətində, ədəbiyyatında oynadığı müstəsna rol bəllidi. Şirvanşahlar mühitinin yetişdirdiyi böyük alim və şairlərin ədəbiyyat tarixində gördükləri işlər zaman-zaman ədəbi-nəzəri fikrə hakim kəsilmişdi. Ümumiyyətlə, «XII əsrdə Azərbaycanın şimalında Şirvanşahlar, cənubunda Eldəgizlər dövlətinin güclənməsi, ticarətin, şəhərlərin gur inkişafı elmin və incəsənətin, o cümlədən ədəbiyyatın da inkişafına güclü təkan verdi. Əcəmi İbn Əbubəkr Naxçıvaninin nadir memarlıq abidələri, Sührəverdinin işraqiyyə fəlsəfəsi, Məhsəti, Xaqani və Nizaminin poeziyası, xalqımızın iqtisadi, ictimai, mədəni inkişafının təcəssümü və ifadəsi oldu» (140, 41). Bu dövrdə, incəsənət və ədəbiyyatın ictimai-iqtisadi inkişafın önündə getməsi təbii-tarixi şəraitlə bağlıdır. XVIII-XIX əsrlərdə Qarabağ ədəbi mühitində də eyni hal təkrarlanır. Bu, bütövlükdə sonrakı

çağlar üçün də xarakterikdir. XIX əsrin Qarabağ ədəbi mühiti bizə XII əsrin Şirvanşahlar, Atabəylər, Qəznəvilər mühitini xatırladır. Lakin bunların spesifikasında kifayət qədər fərqlər var ki, bu da mühitin, dövrün fərqliliyi kontekstində meydana çıxır.

Qarabağ ədəbi mühitinin genetikası əvvəlki dövrlərin ənənsinə bağlanır. Burada bir istiqamətdə türk təkyələri, təriqət düşüncəsi dayanırsa (nəqşbəndilik), digər istiqamətdə Şərq ədəbiyyatı ənənələri (klassik üslub) aparıcılıq qazanır. Bu mənada Qarabağ ədəbi mühitinin mahiyyətinin, inkişaf tarixinin açılması, mühüm dəyər kəsb edir. Ilk öncə yada düşən informativ faktlar olur. «Kitabi-Dədə Qorqud» dastanlarının müqəddiməsindəki birinci cümlədə deyilir: «Rəsul əleyhissəlam zamanına yaxın Bayat boyundan Qorqud Ata derlər bir ər qopdu» (74, 14). Sonrakı çağlarda Füzulinin bayat elindən olması, M.P.Vaqifin bu boya məxsusluğu özlüyündə bir şəcərə xatırlamasıdır. Bunun alt qatında isə böyük yaradıcılıq ənənəsi dayanır və bütün bunlar XVIII-XIX yüzilliklərdə təkrarlanır.

Məlum olduğu kimi, Nadir şahın hakimiyyəti zamanında siyasi proseslər ziqzaqvari, enən-qalxan istiqamətdə gedirdi. Pənah xan da həmin proseslərin içində idi. Nadir şahın vəfatından sonra Azərbaycanın ictimai-siyasi həyatında yeni bir mərhələ başlayır. Artıq xanlıqların yaranması ilə mühitlər formalaşır. Qarabağ xanlığı, Qarabağ ədəbi mühiti buna nümunədir. Xanlığın inkişafı bir növ mühitin çiçəklənməsi üçün zəmin yaradırdı. Bayat qalasının, onun ardınca «Şahbulağı» adı ilə məşhur olan Tərnəküt qalasının bina edilməsi məşhurdur. «Bundan maəda Şuşa şəhəri mənbeyi-fəzlü kamalat olub bir çox mahir ədiblər və rəvantəb şairlər ərseyi-vücuda gətiribdir»

(75, 153). Bu, özlüyündə Qarabağ ədəbi mühiti haqqında bütöv təsəvvür yaradır. Xanlığın formalaşması ədəbi mühiti də inkişafa sövq etdi. Heç şübhəsiz, həmin dövrə qədər pərakəndəliklə nəzərə çarpan yaradıcılıq ənənəsinin yeni mərhələyə qədəm qoyması prosesi gedir. Tarixi mənbələr, eləcə də ayrı-ayrı bədii nümunələrdəki informasiyalar bu mühitin XVII əsrdə yaşayan və həyatlarının bir hissəsi XVIII əsrə düşən şəxsiyyətlərin də mövcudluğunu özündə daşıyır. Məsələn, Molla Pənah Vaqifin müasiri olan Kərbəlayi Səfi Valeh şeirlərinin birində xüsusi olaraq vurğulayır.

Mənəm Aşiq Məhəmmədin novbatı,
Aşıq Cünun, Aşıq Güllü nabatı.
Aşıqlıqda hər kəsdənin övladı,
Valeh ilə bərabərsə de, gəlsin! (23, 14).

Bütün bunlar və bu kimi nümunələr Qarabağ ədəbi mühitinin əski zamanlardan gələn tarixi haqqında ilkin məlumatlar verir. F.Köçərli maraqlı olacaq bir tərzdə vurğulayır: «Burada adları zikr olunan məşhur qələm əhllərindən və üləmalardan başqa Qafqaziyada hər bir əsr və zamanda sair möhtərəm və danişmənd şəxslər dəxi vücuda gəlibdir ki, özlərindən sonra əsərləri qalıbdır və o əsərlər cümlə ürəfa və ərbabi-kamal indində məqbuldur» (75, 152). Bu, XVIII əsrdə də belə olmuşdur. Qarabağ ədəbi mühitində XVIII əsrdə və XIX əsrin başlanğıcında bir sıra söz ustadları məşhurlaşmışdır ki, bunlar sırasında Kərbəlayi Abdulla ibn Cani, Kərbəlayi Qəhrəman, Baba bəy, Aşıq Qənbər kimi müqtədir sənətkarlar olub. Bir məqamı qeyd edək ki, Qasım bəy Zakir Baba bəyi (Mehribanlı) özünə mürşid, ustadi-kamil hesab edir. Molla Pənah Vaqif yaradıcılığının mühüm bir hissəsi də, məhz, həmin mühitlə bağlı olub onun inkişafını xarakterizə edir.

Bu haqda F.Köçərli belə yazmışdır: «Bir halda ki, şairin sərgüzəştini Qarabağ xanlığının tarix və keyfiyyətindən ayırmaq olmaz və bundan maəda Şuşa şəhəri mənbeyi-fəzlü kamalat olub bir çox mahir ədiblər və rəvantəb şairlər ərseyi-vücuda gətiribdir» (75, 152). Hələ Molla Vəli Vidadinin də XVIII əsrdə Cavanşir tayfası ilə yaxınlığı, bir müddət bu mühitdə yaşaması (Gülüstan xanlığı) fakt kimi böyük dəyər qazanır və mühitin inkişaf istiqamətini səciyyələndirir. Ağ qız oğlu Pirinin, Molla Pənah Vaqifin məktubları həmin mərhələnin şeir ənənəsini səciyyələndirir. «Ey Vidadi, genə xan qulluğanda qaim olub nə qiyamət eylərsən» deyən şair ruhu etibarilə klassik ənənədən gələn özünəməxsusluq faktını səciyyələndirir. Bu mühitin öyrənilməsi istiqamətində Mirzə Yusif Nersesov (78), Adolf Berje, H.Ə. Qaibov (84), Məhəmmədağa Müctəhidzadə (113), M.M.Nəvvab (130) çox böyük işlər görmüşlər. Həmin sırada S.Mümtaz (114), F.Köçərli (75) də var. Onlar bir növ digər mühitlərlə yanaşı Qarabağ ədəbi mühitinin öyrənilməsi işinin başlanğıcını qoymuşlar. Bütün bu məlumatlar, toplamlar həmin ədəbi prosesi izləmək üçün kifayət qədər şərait yaradır. Onu da qeyd edək ki, bu mühitin formalaşmasında və belə böyük zənginləşmə prosesi keçirməsində Qarabağ xanlığının müstəsna rolu olmuşdur. Ibrahim xanın Molla Pənah Vaqifi saraya gətirməsi və onun böyük istedad sahibi olması, bir növ ədəbi prosesin inkişafına rəvac vermişdir. Məhəmmədağa Müctəhidzadə onun Molla Vəli Vidadi ilə Qarabağa gəlişini maraqlı olacaq tərzdə «fəsahət gülşəninin bülbülü» adı ilə vurğulayır. «Bu fəsahət gülşəninin bülbülünün adı Molla Vəli və məhəlli-madərzadı Qazax mahalıdır. Sənəyi- min yüz altmış doqquz hicridə Molla Pənah Vaqif təxəllüs ilə bir yerdə tərki-vətəni-məluf qılıb Qarabağ torpağını

qüdumi-meymənət lüzumları ilə müzəyyən ediblər və dideyi-ərbabi-kamalı mehr-məhəbbətləri ilə rövşən» (113, 29) olubdur. Bu məsələnin XVIII əsrdəki ümumi mənzərəsinin bir tərəfidir. Eyni zamanda həmin dövrdəki zənginləşməni səciyyələndirir. Türk şeir ənənəsinin Əhməd Yasəvidən, Yunis Əmrədən gələn intişarı XVI əsrdə Şah Ismayıl Xətai, Qurbani yaradıcılığı ilə yeni dəyər qazanırsa, XVIII əsrdə Qarabağ ədəbi mühitində artıq mərhələ kimi səciyyələnir. Molla Vəli Vidadi, Molla Pənah Vaqif onun ən böyük uğuru kimi xarakterizə olunur. «Bundan maəda Vaqifin milli ədəbiyyatımıza hüsni-xidməti bu olubdur ki, Türkiyə və Iranzəmin şüərasına müqəllidlik etməyibdir, bəlkə onun üçün əsan və təbii bir yol açılıbdır ki, ondan sonra gələn şairlər ona peyrəvilik edib, bir çox gözəl əsərlər meydana gətiriblər. Bu cəhətə Molla Pənah Vaqifin Qafqaziyada vücuda gələn şairlərin babası və ustadı adlanmağa haqqı vardır» (75, 191).

Dövrün ədəbi prosesini izlədikdə, əvvəlki və sonrakı mərhələlərə diqqət yetirdikdə bu aydınlıqla seçilir. Eyni zamanda digər istiqamətdə Qarabağ ədəbi mühitini xarakterizə edir. Molla Pənah Vaqifin bu mühitdəki fəaliyyəti bütövlükdə ədəbi prosesə, Azərbaycan şeirinə təsir göstərirdi. Ona yazılan müraciətlər bunun bariz nümunəsi idi. «Heca vəznində, sadə, aydın bir dillə bu təsirdə şeirlər yazmaq bütövlükdə Azərbaycan boyu aydınlıqla nəzərə çarpırdı. Xalq şeiri tərzində yazan, ifadə və dil rəvanlığı ilə seçilən maraqlı bir ədəbi mühit formalaşmaqda idi. Onun isə özəyi, kökü Qarabağda yaranıb təşəkkül tapırdı. Çünki orada belə bir məktəb yaradacaq, öz yüksək keyfiyyətləri ilə seçiləcək Vaqif kimi istedadlı şair fəaliyyət göstərirdi» (19, 20).

XVIII əsr Qarabağ ədəbi mühitini xarakterizə edəndə ən maraqlı istiqamətlərdən birini aşıq yaradıcılığı təşkil edir. Bu dövrdə onun Aşıq Cünün, Aşıq Güllü, Aşıq Səməd, Aşıq Valeh, Aşıq Qənbər, Aşıq Cəlal və s. kimi qüdrətli nümayəndələri olub. Bunlar özlüyündə ədəbi mühitin zənginləşməsi istiqamətində çox böyük işlər görüblər. Təsadüfi deyildir ki, Aşıq Valeh ustadı Aşıq Səməd haqqında danışanda böyük fəxarətlə «Ustadım Səməddir, sakini-Abdal, Onu görən kəsin nitqi olar lal» deyə vurğulayır.

Ustad Səməd sənətdə bir dağ idi,
Kələntərli Alı fəndli bağ idi.

On il əvvəl Molla Pənah sağ idi,
Valeh kimi aşıqlar ustadı var (23, 26).

Bu nümunə XVIII əsr Qarabağ ədəbi mühiti haqqında kifayət qədər informasiya verir. Təkrar qeyd edək ki, yuxarıdakı şeir məhz həmin dövrün ədəbi faktıdır. Eyni zamanda informativ xarakteri ilə səciyyələndirilməkdən əlavə mühiti qiymətləndirmədi. Belə nümunələr o dövr poeziyada və ondan sonrakı mərhələdə bir silsilə təşkil edir. Orada daha çox dövrün hadisələrini, mühiti dəyərləndirmə gözə çarpır.

Hanı Molla Pənah, bivəfa cahan,
Təxəllüsü Vaqif nəzmi dürəfşan.

İndi eyləmisən xak ilə yeksan,
Tapmaq olmaz o kamalda can hanı? (23, 44)

Bu təkcə Molla Pənahı bir sənətkar kimi qiymətləndirmə amalına yüklənmir. Eyni zamanda mühitin formalaşma spesifikasını aşkarlayır və hansı sənət şəcərəsində dayandığını ortaya qoyur. Sonrakı çağların sənətkarlarından Qasım bəy Zakir, Cəfərqulu xan Nəva,

Mirzə Həsən Mirzə, Aşıq Pəri, Məhəmməd bəy Aşiq, Ağabəyim Ağabacı, Xurşidbanu Natəvan, Mir Möhsün Nəvvab və s. kimi onlarla sənətkarlar məhz XVIII əsr Qarabağ ədəbi mühitinin sonrakı çağlarda yetişdirdiyi sənətkarlardı. Onu da qeyd edək ki, Qarabağ ədəbi mühitinin XVIII əsrdəki təsir dairəsi təkcə həmin mühitlə məhdudlaşmır. Buradakı böyük yaradıcılıq uğurları bütün Azərbaycan boyu yayılır. Təsadüfi deyil ki, «XIX əsrdə şifahi xalq yaradıcılığının başqa janrları Valehin adı ilə bağlıdır. Qarabağ şərilisi aşığın ziyasının bir sıra görkəmli nümayəndələri yetişir. Aşıq Alı, Şəmkirli Aşıq Hüseyn, Aşıq Musa, Molla Cümə, Aşıq Mahmud, Varxiyanlı Aşıq Məhəmməd, Aşıq Əhməd, Yəhya bəy Dilqəm, Aşıq Ələsgər, Aşıq Hüseyn Bozalqanlı, Xaltanlı Tağı və başqaları belə sənətkarlardandır» (43, 276). Bütün bunlar özlüyündə Qarabağ ədəbi mühitinin daxilində digər bir mühitin mövcudluğundan xəbər verir. Bu XVIII-XIX əsrdə mövcud olan Qarabağ aşıq mühiti idi.

Məlum olduğu kimi, aşıq yaradıcılığı türkün ən əski və özünəməxsusluqla nəzərə çarpan yaradıcılıq sahəsidir. Təsadüfi deyildir ki, aşığı elin, xalqın anası adlandırırlar. O, bütün məqamlarda xalqla birlikdə olub, sevincinə sevinib, kədərinə ağlayıb. Dədəm Qorquddan üzü bəri elin-obanın mənəvi dəyərlərini sonrakı çağlara daşıyıb. Lakin çox təəssüflər olsun ki, bu böyük yaradıcılıq sahəsi şifahi mədəniyyətin bir hissəsi kimi təzkirəçilərin, toplayıcıların diqqətini elə də ardıcıllıqla cəlb etməyib. Ancaq bu sənətkarlar öz sazı-sözü ilə yaddaşlarda yaşayıb. Bu bütövlükdə aşıq yaradıcılığı ilə bağlı məsələ olub XVIII-XIX əsrdə də Qarabağ ədəbi mühitinin tərkibinə daxildir.

Son dövrlər aşıq yaradıcılığı mühitlər səviyyəsində araşdırılmaqdadı. Şirvan aşıq mühiti, Təbriz aşıq mühiti,

Göyçə aşıq mühiti, Borçalı aşıq mühiti, Qazax, Tovuz, Gədəbəy və s. aşıq mühitləri buna nümunədi. Bu istiqamətdə folklorşünaslıqda bir-birindən maraqlı araşdırmalar aparılıb. Qarabağ aşıq mühiti də, həmin sıradadır. Folklorşünas M.Allahmanlı XVIII əsr Qarabağ aşıq mühitini tədqiq edərək onu bir növ digər mühitlərlə, eləcə də XVIII əsr Qarabağ ədəbi mühiti ilə müqayisədə araşdırıb. Hələ bura qədər Ü.Hacıbəyov, Bülbül, F.Mehdi, M.Rahim, S.Rüstəm, F.Şuşinski, M.Qasımlı Qarabağ aşıq mühiti, sazəndə və xanəndələrlə bağlı müxtəlif məqamlarda fikirlər yürütmüşlər. Qarabağ aşıq mühiti türk şeir ənənəsini, onun inkişaf tarixini öyrənmək uçün də kifayət qədər material verir. Aşıq Səmədin, Aşıq Qənbərin, Aşıq Cəlalın, Aşıq Güllünün bizə gəlib çatan şeirləri, deyişmələri sözün həqiqi mənasında böyük informasiyaya malikdi. Dövrün ictimai-siyasi proseslərinə münasibət, yurd, torpaq sevgisi, təmiz məhəbbət hisslərinin təcəssümü bu sənətkarların hansı ideyalarla yaşadığını əks etdirir. XVIII-XIX əsrdə Qarabağ aşıq mühitindəki mənzərə haqqında tam təsəvvür yaratmaq üçün Aşıq Valehin deyişmələrinə diqqət yetirmək kifayətdir. Təsadüfi deyil ki, Aşıq Valehi XVIII əsr aşıq yaradıcılığının zirvəsi hesab edirlər (21). Onun öz dövrünün ustadları ilə qarşılaşması nəinki folklorşünasların (S.Mümtaz, H.Əlizadə, M.H.Təhmasib, P.Əfəndiyev, M.Həkimov, V.Vəliyev, Q.Vəkilov, M.Qasımlı, M.Allahmanlı) hətta təzkirəçi və ədəbiyyatşünasların, müxtəlif sənət adamlarının da marağına səbəb olub. M.Y.Nersesov, A.Berje, H.Ə.Qaibov, M.M.Nəvvab, M.Müctəhidzadə, F.Köçərli, F.Qasımzadə, M.Rahim, S.Rüstəm, F.Mehdi və başqaları müxtəlif səpkili münasibət bildiriblər. Bu mühitdəki mənzərəni təsəvvür etmək üçün təkcə Aşıq Valehin deyişdiyi sənətkarların coğrafiyasına baxmaq kifayətdir.

Türkiyədə Aşıq Feyruz, Ərdəbildə Aşıq Mahmud, Naxçıvanda Aşıq Süleyman, Şirvanda Pərizad, Məsum Əfəndi, Dərbənddə Zərnigar xanımla döş-döşə gələn Aşıq Valeh bütün vəziyyətlərdə qalib çıxmış, bir ustad kimi pürkamal olduğunu göstərmiş və «Ustadım Səməddir, sakini-Abdal»- deyərək öz ustadını böyük fəxarət hissi ilə xatırlamışdır. Azərbaycan dastanlarının ən mükəmməllərindən olan «Valeh və Zərnigar» da məhz həmin mühitin yaradıcılıq faktıdır.

XVIII-XIX əsrdə Qarabağ ədəbi mühiti ilə sazəndə və xanəndə mühitləri arasında sərhəd qoymaq olmur. Bir növ bunlar bir-birilə möhkəm bağlılıqda, təmasda inkişaf edir. Məhz bu baxımdan ayrı-ayrı sənətkarların bir-birinə müxtəlif müraciətləri böyük dəyər kəsb edir. Bu, bir tərəfdən dövrün ictimai-siyasi proseslərini səciyyələndirirsə, digər tərəfdən də üslub özünəməxsusluğu kimi əhəmiyyət kəsb edir. Burada maraqlı məqam aşıq yaradıcılığından gələn deyişmə ənənəsidir. Klassik ədəbiyyatda onun tarixi N.Gəncəvinin «Xosrov və Şirin» (57) poemasındakı Xosrovla Fərhadın deyişməsinə gedib çıxır. Türk xalq şeiri ənənəsində isə bu, «Kitabi-Dədə Qorqud» (74) dastanlarında özünü aydınlıqla göstərir. Məsələn, «Baybura oğlu Bamsı Beyrək boyu»nda Beyrəklə bacısı arasında olan söhbət bu səciyyəlidir. Eləcə də daha əski çağların düşüncəsini əks etdirən Qışla Yazın deyişməsi tipikdi. Belə bir istiqamət XVII əsr Qarabağ ədəbi mühitində M.P.Vaqifə olan müraciətlərdə, Vaqiflə Vidadinin deyişməsində, eləcə də Kərbəlayi Səfi Valehlə Aşıq Qəmbər, Abdulla Canıoğlu, Bababəy arasında olan deyişmələrdə yeni dəyər qazanır. Bütün bunlar deyişmədən, aşıq qarşılaşmalarından, ayrı-ayrı şairlərin məktublaşmalarına, müraciətlərinə qədər hərəkət edərək rəngarənglik

qazanır. Onu da qeyd edək ki, bu müraciətlər təkcə Qarabağ ədəbi mühiti ilə məhdudlaşmır. Eyni zamanda digər ədəbi mühitləri də əhatə edir. Şirvan, Naxçıvan, Təbriz, Lənkəran, ədəbi mühiti ilə bağlı yazışmalar buna canlı nümunədir. Digər istiqamətdə Qarabağ aşıq mühitindəki deyişmələr bunun bariz nümunəsidir. Bütün bunlar mühitin qaynarlığını və yaradıcılıq spesifikasını özündə əks etdirir. Məsələn, Aşıq Valehin Molla Pənah Vaqifə məşhur müraciəti klassik ədəbiyyat faktıdır:

Molla Pənah, ərzin sisə söyləyim,
Mahallıqca biz düşmüşük dara bil.
Şadlığı axtaran biçarə kəslər,
Həmdəm olub yenə ahi-zara bil (19,73).

Bu tip müraciətlər həmin dövr ədəbi prosesdə kifayət qədərdi. Aşıq Valehin Molla Pənah Vaqifə müraciəti başa düşüləndi və bir el aşığının bir qüdrətli şairə münasibəti, yaxınlığı qədərdi. Aşıq Valeh yaşadığı kənd çərçivəsində qalmayıb sazı-sözü ilə dastana çevrilmiş, hətta xan sarayına belə yol tapıb, xanlığın xüsusi hörmətini qazanmış Vaqif kimi böyük düha ilə yaxınlıq etmişdir. «O dövr ədəbiyyatın önündə məhz Vaqif gedirdi və onun sayəsində xalq şeiri tərzində yazan, ifadə və dil rəvanlığı ilə seçilən maraqlı bir ədəbi mühit formalaşmaqda idi. Bu formalaşmanın özəyi, kökü isə Qarabağda yaranıb təşəkkül tapırdı. Çünki orada belə bir ədəbi məktəbi yaradacaq, öz yüksək sənət keyfiyyətləri ilə seçiləcək Vaqif kimi istedadlı bir şair fəaliyyət göstərirdi» (19, 20). Bütün bunlar XVIII əsr Qarabağ ədəbi mühitinin zənginləşmə və inkişaf istiqamətini göstərir. Ona ən böyük və dəqiq dəyəri isə elə həmin dövrdə iki misra ilə Molla Pənah Vaqifin dostu M.M. Vidadi özü verir və «Külli Qarabağın abi-həyatı, Nərmü nazik bayatıdır, bayatı» deyirdi. Bu ruh XVIII

əsrdə Kərbəlayi Şəfi Valehin, Abdulla Canıoğlunun, Şair Qənbərin, Musa Kəlimullahın, Aşıq Səmədin, Aşıq Cəlalın, Baba bəyin və başqalarının şəxsində dəyərlənirdi. Molla Pənah Vaqif bu sənətkarların ədəbi mühitdə yeri ilə bağlı müxtəlif məqamlarda fikir də söyləmişdir. Bu, özlüyündə qüdrətli sənətkarın dəyərləndirməsidir. Məsələn, Kəlimullah Musa haqqında xüsusi bir şövqlə vurğulayır:

Qarabağ içrə bir şair Kəlimullah Musadır,
Cavanşir içrə bir mövzun bayatı dəsti-beyzadır.(130,15)

M.P.Vaqifin xüsusi bir rəğbət hissi ilə vurğuladığı bu sənətkarın yaradıcılığı haqqında mənbələr kifayət qədər məlumat vermir. Saraya yaxınlığı ilə seçilən bu şair dövrünün təbli şairlərindən olmuşdur. Məhz M.P.Vaqif də onun yaradıcılığına xüsusi bələd olduğu üçün belə xatırlamışdı. Bunu Kəlimullah Musanın əlimizə çatan şeiri də aydınlıqla göstərir:

Zalım fələk, sənə netdim, neylədim,
Əcəl qılıncları çalhaçaldadır.
Hansı halalını haram eylədim,
Bəlasız başımız qalmaqaldadır.

Şirvanlı Çələbi döyülüb qaçdı,
Qacar Məmmədhəsən bir oyun açdı,
Ovşar Fətəli də yolunu çaşdı,
İndi başqa fikir, başqa haldadır.

Qızmış şirə döndü Ağəmməd Qacar,
Qarabağa gətdi qanlı bir azar
O, saymadı, bax gör fələk nə sayar?
Leşi gorda, başı bizim yaldadır.

Yasa döndü bütün toylar-düyünlər,

Ələ düşdü nazlı qızlar-gəlinlər,
Ləkələndi ismət, namus yəminlər,
Bu cəza nə yerdə, nə mahaldadır. (87, 341)

Bu şeir müəllif haqqında kifayət qədər informasiya verir və Molla Pənah Vaqifin ona hüsn-rəğbətinin təsadüfi olmadığını aydınlıqla göstərir. Qeyd etmək zəruridir ki, burada müəllifin ictimai kədəri ilə şəxsi ağrıları birləşir və aydınlıqla ifadə olunur. Çünki şeir Şirvanlı Çələbi, Məhəmməd Qacar, Ovşar Fətəli və s. tarixi ad və hadisələrlə bağlı informasiyaya yüklüdü. Bunlar eyni zamanda müəllif haqqında mülahizələr yürütməyə, XIX əsrin əvvəlində baş verənlərin canlı şahidi olmasını deməyə imkan yaradır. Məlum olduğu kimi, bu dövr Qarabağ ictimai-siyasi mühitində, eləcə də Qafqazda, Azərbaycanda hadisələrin kəskinləşdiyi bir dövr idi. Musa Kəlimullah da bir yaradıcı kimi həmin ağrıların içində yaşayırdı və heç şübhəsiz, baş verənlərə biganə qala bilməzdi. Məhz bu nümunə də həmin vəziyyətin ifadə faktıdır. Bir növ M.P.Vaqifin son şeirləri, Kərbəlayi Səfi Valehin müraciətləri, Şair Qənbərin tənələri tipindədir. Məhz belə bir müştərəklik həmin mühitin bütün nümayəndələri arasında yaxınlıq yaradırdı. Başqa sözlə, müraciət formasının bu dövrdə ortaya çıxması ədəbi prosesdə narahatçılığın faktı kimi görünür. Musa Kəlimullahda da belədir. Onun bu şeirində ittiham və tarixi faktların xatırlanması, ibrət dərsi kimi təsir bağışlayır. Beləliklə, bu nümunə onun ahıllıq dövrünün həqiqəti kimi meydana çıxır və şairin xüsusi istedad sahibi olmasını təsdiqləyir. Bu səbəbdən də Molla Pənah Vaqif onun barəsində «Qarabağ içrə bir şair» deyə vurğulayır. Bu şeir Musa Kəlimullah yaradıcılığından bizə gəlib çatan yeganə nümunədir. Şeirdə Musa Kəlimullahın şəxsi həyatı ilə bağlı məqamlar da

diqqəti cəlb edir. Məsələn, «hansı halalını haram eylədim»-deməsi müəllifin hansı düşüncələrlə yaşadığını, necə ağrılı hadisələrin canlı şahidi olduğunu hiss edirik. Aydın olur ki, qoca yaşlarında olan şair halallıqla yaşamış və həyatın isti-soyuğunu dadmış, bir sıra tarixi hadisələrin şahidi olmuşdur. Həmçinin belə güman etmək olur ki, Musa Kəlimullah ailə həyatı qurmamış və onun nəsil davamı olmamışdır.

Həmin sırada Yusif Kosa Qarabaği, Aşıq Əli Kəlibri Qarabaği (F.Köçərli Qaracadağlı kimi qeyd edir), Rafe, Əsəd bəy, Sabit, Mehdi bəy, Şair Qənbər, Abdulla Canıoğlu, Baba bəy də var. Bunlar hamısı Qarabağ ədəbi mühitini tam şəkildə canlandırır.

Aşıq Əli ilə bağlı bir məsələni qeyd edək ki, ona münasibətdə, daha doğrusu, nisbəsinin qeyd olunmasında bir fərqlilik var. Məsələn, Mir Möhsün Nəvvab Kəlibri (130, 547), Məhəmmədağa Müctəhidzadə Aşıq Əli (113, 31), F.Köçərli Əli Gəlibəri kimi (75, 159) qeyd edir. «Əslən Kəlibər əhlindən olub bir müddət sonra gəlib bu diyari-minu asarı özü üçün məskən qərar etmiş və Molla Pənah Vaqif ilə bir əsrdə bulunub münazirə etməyə məşğul var imiş. Bəzi nüsxələrin müşahidəsi bu iki zati-alimiqdarın hər birinin sifteyi-hüsni-bir məşuqi-məcazi olmasını məlum və aşkar etdi» (113, 31). Onun Molla Pənah Vaqifə «ey alicənab» deyə müraciətlə yazılmış «Gəlmiş» adlı şeiri mənbələrdə özünə geniş yer almışdır:

Bu gövhər sözlərin, ey alicənab,
Tamam aşiqlərin şəninə gəlmiş.
Fəsahətdə, bəlagətdə sənin tək,
İnanma ki, ruyi-zəminə gəlmiş.

Bu əsrdə şairlərin xanisən,

Müddərisə bərabərsən yəni sən.
Elmin mədənisən, gövhər kanisən,
Eşidənlər sözün dəminə gəlmiş (75, 159).

Belə müraciətlər XVIII əsrdə ənənəviliklə nəzərə çarpır və təkcə M.P.Vaqiflə digər müasirləri arasında fikirlərini bölüşmə, hiss və duyğularını ifadə etmək xarakteri daşımır. Eyni zamanda onların həyatının bəzi məqamlarını özündə yaşatmaq xüsusiyyəti ilə dəyər kəsb edir. Məhz yuxarıdakı nümunədə də bu hal özünü aydınlıqla göstərir. Aşıq Əli Gəlibəri bu şeirilə M.P.Vaqifin XVIII əsr Qarabağ ədəbi mühitində, eləcə də Azərbaycan poeziyasında yerini çox dəqiq ifadə edir. Xüsusi olaraq bu əsrdə şairlərin xanı kimi ad qazanmasını, müdərrisə bərabərliyini, elmin mədəni gövhər kanı olmasını bir qeyri-adiliklə vurğulayır. Təkrar qeyd edək ki, bu M.P.Vaqifə öz dövründə verilən qiymətdi. Şeirin sonuncu bəndində bir başqa istiqamətdə maraqlı olacaq məqamla qarşılaşırıq.

Əli çəkər gecə-gündüz ahü zar,
Kəsildi müdava, getdi ixtiyar.
Vaqif olsun bu mənadan xəbərdar,
Mədinə kuyinə Səkinə gəlmiş. (75, 159-160).

Məhəmmədağa Müctəhidzadə bu məqamla bağlı olaraq yazır: «Aşıq Əli isə Səkinə nama aşiq və paybənd imiş. Belə ki, məhbubeyi-pəri-rüxsarəsi Şuşa şəhərinə varid olan zaman bu sözləri Vaqif təxəllüsə yazıb göndərib» (113, 31). Bu, özlüyündə M.P.Vaqiflə Aşıq Əli Qaracadağlının arasındakı yaxınlığın ifadəsidir. Eyni zamanda nümunə M.P.Vaqifin həyat yoldaşı Mədinə xanım ilə Aşıq Əli Qaracadağlının qadını Səkinə xanımın görüşməsini özündə yaşadır. Belə yazışmalar təkrar qeyd edək ki, M.P.Vaqif səviyyəsində məhdudlaşmır. Dövrün digər sənətkarları arasında da özünəməxsusluqla davam edir. Məsələn,

Kərbəlayı Səfi Valehlə Abdulla Canıoğlu, Şair Qənbər, Aşıq Səməd, Aşıq Cəlal, Baba bəy arasında olan yazışma və deyişmələr, olunan müraciətlər bunun ifadəsidir və ədəbi prosesi, onun zənginliyini səciyyələndirir. M.Y.Nersesov, A.Berje, H.Ə.Qaibov, M.M.Nəvvab, M.Müctəhidzadə, F.Köçərli öz əsərlərində onlarla bağlı yetərli nümunələr verir. Bunlar bəzən bir-birinə ərkyana giley-güzar, tənə, zarafat kimi də görünür. Məsələn, Baba bəyin, Abdulla Canıoğlunun, Şair Qənbərin Kərbəlayi Valehin qocalığı ilə bağlı yazdıqları şeirlər də bunu göstərir. Belə ki, «onun ilə Baba bəyin, Ibn Canının, Aşıq Qənbərin beyinlərində zərafət olduğu üçün bir-birinə həzl təriqi ilə sözlər deyərlərmiş. Belə ki, mərhum Baba bəy Valehin qocalığını həcv edib:

Hər kimsə axtarar tapar tayını,
Sən də çağır gəlsin Xulxunsayını,
Söhbəti-üqba eləsin, guş qıl,
Ləzzəti-dünyanı fəramuş qıl…i.a.» (75, 321).

Bütün bunlar XVIII əsr Qarabağ ədəbi mühitini yetərincə səciyyələndirir. Eyni zamanda oradakı prosesləri, mövzu və düşüncə istiqamətlərinin fərqlilik və yaxınlıq məqamlarını öyrənmək üçün kifayət qədər informasiya verir. Burada dövrün ictimai, siyasi, dini, fəlsəfi, əxlaqi düşüncəsi toplandığına görə həmin istiqamətlər bir problem kimi aktuallıq kəsb edir. Hətta maraqlıdır ki, bu istiqamət özünü yazışma və deyişmələrdə də göstərir. Necə ki, M.P.Vaqif həyatının son dövrlərində Qarabağın və özünün başı üstünü təhlükə və təhdidlər aldığı vaxtda əvvəlki müraciətindən tamamilə fərqli olacaq bir formada M.V.Vidadiyə «Ey Vidadi, gərdişi-dövrani kəcrəftarə bax, Ruzigara qıl tamaşa, karə bax, girdarə bax» deyə müraciət edirdi. Böyük ədəbiyyatşünas F.Köçərli bu sənətkarların

yaradıcılığı ilə tanış olduqdan sonra son dərəcədə əhəmiyyətli olacaq qənaətə gəlir və eyni zamanda maraqlı bir şəkildə «bizim türklərdə bu hissiyyat və qədirşünaslıq yoxdur. Şan və şərafətimizlə, vətən və millətimizin şərəfrarlığına səbəb olan, dilimizə və ədəbiyyatımıza rövnəg verən əziz və möhtərəm vücudların qədr və mənzilətini bilmirik və onların asari-kuzidələri ilə iftixar etmirik. Əzbəs ki, avamlıq və avamlığımızdan milliyyət hissi bizlərdə ayılmayıbdır, vətənimizin, dilimizin və ədəbiyyatımızın qədrini bilmirik» (75, 212). Bu, müəllifin M.V.Vidadi haqqında dediklərini ümumiləşdirərkən gəldiyi son qənaətdir. Eyni zamanda M.V. Vidadi ilə bağlı müəyyən təsəvvür yaradır. Lakin təzkirələr, ayrı-ayrı toplular, monoqrafiya və digər işlər bu zəngin irsin diqqətdən kənarda qalmadığını qeyd etməklə bərabər, sistemli araşdırmaların olmaması fikrini də ortaya qoyur.

Qarabağ ədəbi mühitinin XVIII əsrdəki inkişafı, zənginliyi XIX əsrdə də uğurla davam edir. Hətta yeni keyfiyyətlərlə, mövzu və ideya axtarışları ilə, ədəbi portretlərin və düşüncələrin fərqliliyi ilə davam etdirilir. Bunların bir hissəsinin yaradıcılığı XIX əsrin əvvəllərinə təsadüf edir və yeni əsrin faktı kimi xarakterizə olunur. Bu mühitin ən böyük uğuru ənənənin qorunması ilə nəzərə çarpır. Eyni zamanda kifayət qədər inkişafla səciyyələnir və ədəbi mühit Q.Zakir, C.Nəva, M.Aşıq, M.H.Mirzə, A.Pəri, M.Mədətov, A.Ağabacı, X.Natəvan, M.M.Nəvvab və başqalarının düşüncəsində zənginləşmə və inkişaf prosesi keçirir. Təsadüfi deyil ki, XIX əsr bu şəxslərin timsalında mühitdə mərhələ kimi dəyər qazanır və bütövlükdə ədəbi prosesə diqtə edir. XIX əsr ədəbiyyatın görkəmli tədqiqatçısı F.Qasımzadə yazır: «XIX əsrdə bu ədəbi cərəyanın Qarabağda Qasım bəy Zakir, Baba bəy Şakir,

Məhəmməd bəy Aşiq, Ağabəyim ağa Ağabacı, Mirzə Həsən Mirzə, Aşıq Pəri, Mirzəcan Mədətov kimi görkəmli nümayəndələri yaşamışlar. Bu şairlərdən Məhəmməd bəy Aşiq, Baba bəy Şakir, Qasım bəy Zakir və Ağabəyim ağa öz yaradıcılıq fəaliyyətlərinə Vaqif hələ həyatda ikən başlamışlar və çox ehtimal ki, onun özü ilə şəxsən tanış olmuşlar» (82, 50). Məhz müəllifin bu ehtimal şəklində böyük inamla vurğuladığı tanışlıq, eyni zamanda şeirlərinin dildə-ağızda, el arasında dolaşması yeni ədəbiyyata qədəm qoyanlarda böyük marağa səbəb olmaya bilməzdi. Ona görə də həmin sənətkarlar bu təsirdə özlərinin ilkin addımlarını atır, orijinal düşüncə tərzləri ilə ədəbi prosesə, mühitə əlavələrini edirdilər. Eyni zamanda bu, təkcə Qarabağ ədəbi mühitilə məhdudlaşmırdı. Bütünlükdə Azərbaycan boyu qaynarlıqla davam edirdi. Qarabağ ədəbi mühiti isə bu mühitlər içərisində daha çox inkişaf tempinə malik idi. Sanki Qarabağda yaranan nümunələr bütövlükdə Azərbaycan ədəbi prosesinə diqtə edirdi.

Q.Zakirin böyük istedadı ilə M.P.Vaqif, M.V.Vidadi ruhu arasında bir yaxınlıq var. Bu ayrı-ayrı şeir faktlarında, bütün yaradıcılıq boyu, eləcə də tale ağrılarında nəzərə çarpır. «Durnalar» şeiri həmin yaxınlığın ən üzdə görünən faktıdır. Eləcə də «Görmədim» müxəmməsi ruhunda yazılmış «Eylər» rədifli müxəmməsi buna əyani sübutdur. Əgər M.V.Vidadi durnalara müraciətlə «Əzəl başdan Bəsrə, Bağdad eliniz» deyirdisə, M.P.Vaqif «Sizə müştaq durur Bağdad elləri» söyləyirdi. Qasım bəy Zakir isə bu ənənəni «Laçın yatağıdır sizin məkanlar» deyə təkrarlayırdı. Hələ bir qədər əvvəldə «Koroğlu» dastanında bu deyim özünə «Göynən gedən beş durnalar, bizim ellər yerindəmi» formasında yer almışdı. Bütün bunlar arasında kifayət qədər möhkəm olacaq bağlılıq var. Kökü etibarilə göründüyü kimi

çox dərinlərə, xalq düşüncəsinə bağlanır və hələ daha əski nümunələrdə, «Kitabi-Dədə Qorqud»da olan tipik məqamlarla səsləşir. Bir növ evi yağmalanan Qazan xanın, su ilə, qurdla, yurdu ilə söhbətləşməsini xatırladır. Məhz bu səbəbdən Qarabağ ədəbi mühiti kifayət qədər maraq doğuracaq zənginliklərlə səciyyələnir. Bütövlükdə isə demək olar ki, M.P.Vaqif və Q.Zakir yaradıcılığı xalq ruhuna köklənir. F.Köçərli məhz bu zənginlikdən çıxış edərək yazırdı: «Bu cür kəlamlar şairin vətən dilini yaxşı bilməyinə şəhadət verir. Farsların Sədisi və rusların Puşkini öz ana dilinin ustadı və xaliqi məsələsində olduğu kimi, Zakir də Azərbaycan türklərinin ustadi-lisani olmağa haqlıdır» (75, 415). Bunu şairin bütövlükdə yaradıcılığı, kifayət qədər ustalıqla yazılmış ayrı-ayrı nümunələri, eləcə də XIX əsr Qarabağ ədəbi mühitinin ümumi mənzərəsi diqtə edir. Q.Zakirin «Dost yolunda cəfa çəkdim, can üzdüm» misralı şeiri bunun ifadəlilik və aydınlıq baxımından tipik nümunəsidir:

Qalmışam göz yolda, könül intizar,
Qəm tutub yaxamı hər yana dartar.
Mən bilmənəm necə bağlanıb yollar,
Bir gələn yox bu virana, ay mədəd.

Ayrı düşmək vətənimdən yamandı,
Diyari-qürbətdə ölüm amandı,
İtirmişəm yarı xeyli zamandı,
Axtarıram yanə-yanə, ay mədəd.(167)

Bu ruh bütövlükdə XVIII əsrdən və daha əski düşüncədən (xalq şeiri nəzərdə tutulur) gələn ənənə kimi Qasım bəy Zakir yaradıcılığı, XIX əsrdə Qarabağ ədəbi mühiti boyu səpələnir. Məhəmməd bəy Aşiqdə də, Cəfərqulu xan Nəvada da, Mirzə Həsən Mirzədə də, Aşıq

Pəridə də və digərlərində də yaşanır. Onun kökləri isə kifayət qədər əski çağlara, xalq şeirinə, xalq düşüncəsinə gedib çıxır. Necə ki, «ay mədəd» müraciətində özünün ifadəsini tapır. Yunis Əmrədən Şah Xətaiyə, oradan da Molla Pənah Vaqifə süzülüb gələn bu ruh bir növ türk düşüncəsinin ən bariz faktı kimi XVIII-XIX əsr Qarabağ ədəbi mühitində yeni dəyər qazanır, özünün inkişafının yeni bir yüksəliş mərhələsini yaşayır.

XIX əsr Qarabağ ədəbi mühitini zənginləşmə istiqamətində və özünün ən yüksək yaşama mərhələsində tədqiq etmək zəruridir. Burada bir növ yeni çalarlar, əlavələr müşahidə olunur ki, bunu da ədəbi prosesin uğurları, rənagarəngliyi kimi şərh etmək ehtiyacı yaranır. Məsələn, ictimai satiranın, mənzum hekayələrin, təmsillərin, dramaturgiya, nəsr nümunələrinin yaranması faktını bütün əsr boyu izləmək mümkündü. Hətta ədəbi məclislərin, təzkirə ənənəsinin, nəqqaşlığın, musiqinin, rəssamlıq kimi yaradıcılıq istiqamətlərinin də buraya əlavə edilməsi ucu-bucağı təsəvvürə çətin gələcək bir zənginliyi özündə ehtiva edir. Onun araşdırılması isə böyük tədqiqatların miqyası səviyyəsindədir. Məlum olduğu kimi, bu mühitdə aparıcılığı daha çox poeziya öz üzərinə götürür. Bunu mühitin ümumi ab-havası da ilkin tanışlıqda əks etdirir. Bir daha təkrar qeyd edək ki, XIX əsr xalq şeiri üslubunda yazmanın tarixi kökləri Azərbaycan türklərinin məşhur və müqtədir şairi Molla Pənah Vaqifdən də əvvələ gedib çıxır. Onun rişələri türkün ilahilərinə, qəhrəmanlıq nümunələrinə, bayatı örnəklərinə dayanır. Sonrakı dövrdə bu ənənənin yeni bir mərhələsi, Şah Xətai, Qurbani zamanı gəlir. Onun poeziyada, ictimai-siyasi mühitdə oynadığı rol, heç şübhəsiz, sonrakı dövrlərdə yaşanırdı:

İki əlim qızıl qanda,

Çox günahlar vardı məndə,
Ya İlahim, kərəm səndə,
Düşkün qula nəzər eylə (147, 30).

Bu xalq ruhunun ifadəsidi və bütövlükdə mahiyyətində, sosial qatlarında xalqdan gələn düşüncəni yaşadır. Ona görə də başlıca fakt kimi gələcək əsrlərə ötürülür. Qurbani-Xətai xətti özlüyündə çox əski çağlardan gələn bir mədəniyyət layının oyanışıdır. Əsrlərin o üzündən sakit-sakit, asta-asta irəliləyən bu ruh Şah Xətai düşüncəsindəki oyanışla nəticələnir və mərhələ kimi görünərək bir növ türk şeirinin intibahı kimi səciyyələnir. Bu düşüncə əski mərhələdən davamlı şəkildə daşınır, ozandan aşığa ötürülür. Qurbani şeirində özünün böyüklüyünə çatır. Xətai yazmışdır:

Kimi ağa, kimi nökər,
Nökər olan cəfa çəkər,
Bülbül ağlar, qan-yaş tökər,
Bağı dolana-dolana. (147, 96)

Poeziyanın inkişaf yolunda Şah Xətaidən, Qurbanidən Molla Pənah Vaqifə keçib gələn yol var. Bu yolun zirvəsi Molla Pənahdır. Məhz bu səbəbdən də F.Köçərli onu türk şeirinin babası adlandırır. Bu zirvənin şüaları, əsrarəngizliyi və ucalığı XVIII və XIX əsrdə Qarabağ ədəbi mühiti, bütün Azərbaycan boyu paylanır. Qasım bəy Zakir, Məhəmməd bəy Aşiq, Cəfərqulu xan Nəva, Aşıq Pəri və başqaları onun uğurudu. Bütün bunlar zəngin bir irs kimi təzkirələrdə daşınır. Bu mənada XVIII-XIX əsr Azərbaycan ədəbiyyatını səciyyələndirən istiqamətlərdən biri təzkirəçilik ənənəsidir.

Təzkirəçiliyin tarixi çox əski çağlara, təxminən XI əsrə gedib çıxır və Şərq ədəbiyyatı üçün xarakterik səciyyə daşıyır. Qarabağ ədəbi mühitinin XIX əsrdə spesifikasını səciyyələndirən faktorlardan biri təzkirəçilik ənənəsidir. Bu

səpkidə Mirzə Yusif Nersesovun, Adolf Berjenin, Məhəmmədağa Müctəhidzadənin, Hüseyn Əfəndi Qaibovun, S.Ə.Şirvaninin, Mir Möhsün Nəvvabın təzkirələri böyük dəyər qazanır.

XIX əsr Qarabağ ədəbi mühitinin ən parlaq dövrüdür. XVIII əsrdən başlayan bu pərvəriş XIX əsrdə də davam edir və yeni məna, çalarlar qazanır. F.Qasımzadə bu zənginlikdə, daha doğrusu, aşıq şeiri tərzində yazmada bir formalizm görür. Heç şübhəsiz, bədii nümunədə forma poetikanın başlıca komponentlərindəndir. Heca vəznində formanın aparıcılığı isə təkzibedilməzdir. Lakin bu, bütün digər məsələləri arxa plana keçirməyə əsas vermir. Belə ki, forma digər komponentlərlə birləşəndə mükəmməl görünür və bədii nümunənin həqiqi sənət faktı olması qənaətini doğurur. Məsələn, M.P.Vaqifin «Bayram oldu, heç bilmirəm neyləyim» (162,161) misralı şeiri, «Görmədim» müxəmməsi, «Bax» (162,169) qəzəli buna nümunədi. Bütün misralar özlüyündə fikrə və poetiklik yaradacaq digər komponentlərə malikdir. Və yaxud da başqa bir nümunəyə diqqət yetirək:

Başına döndüyüm toy adamları,
Siz də deyin toya gələn oynasın.
Adını demirəm eldən ayıbdı,
Filankəsin qızı filan oynasın. (162, 170)

M.P.Vaqif poeziyasının mükəmməlliyi, sirri-sehri bu misralarda daha aydınlıqla hiss olunur. Bütöv bir düşüncəni ortaya qoyan bu misralar böyük mənəvi dəyərləri özündə əks etdirir. Məhz bu cür orijinal deyim və düşüncə ilə şair ədəbi mühitə, özünəqədərki klassik ənənəyə diqtə edirdi. Bu, müəyyən məqamda sonrakı dövr poeziyanın inkişafı haqqında informasiya verir. F.Qasımzadə bu zənginlikdə nəzirəçilik xarakterinin olduğunu da vurğulayır:

«Formalizmdən başqa bu dövrün yazılı ədəbiyyatındakı aşıq şeirində nəzirəçilik də hökm sürürdü. Yaradıcılıq qabiliyyəti zəif olan şairlər ustad xalq aşıqlarını və ya Vaqif, Zakir, Nəbati kimi istedadlı sənətkarları təqlid yolu ilə şeirlər yazırdılar. Beləliklə, yazılı ədəbiyyatdakı aşıq şeirində də nəzirəçilik yayılırdı» (82,50).

Bir faktı qeyd edək ki, nəzirəçilik XIX əsr ədəbi mühiti üçün təbii idi. Çünki həmin ədəbiyyatın mənzərəsində təsirlər də olmalıydı. Vaqifin təsiri hələ öz dövründən keçərək bu əsrdə də yaşanırdı. Təkcə onu demək kifayətdi ki, yuxarıda verdiyimiz nümunənin təsirilə onlarla şeir yaranmışdı. Heç şübhəsiz, bu, M.P.Vaqif təsiri idi və hamısından da axıra qədər mükəmməllik gözləmək mümkün deyildi. Belə bir xətt həmin mərhələdə aşıq yaradıcılığında da özünü göstərir. Məsələn, Aşıq Allahverdinin «Bir maral baxışlı, tərlan cilvəli, Gəlib məni gördü, güddü qayıtdı» şeiri XVIII əsrin ədəbi faktıdı. Lakin eyni təsirdə və ruhda XIX əsrdə onlarla şeir yazılıb. Heç şübhəsiz, burada formalizm və nəzirəçilik halları da mümkündür. Ancaq əsas olan budu ki, XIX əsrdə Qarabağ ədəbi mühiti inkişafla, qaynarlıq və rəngarəngliklə səciyyələnir. Burada təbiətin əsrarəngiz füsunkarlığından, ta ictimai-siyasi mühitin mənzərəsinə qədər hər şey özünə yer tapır. Onu da qeyd edək ki, aşıq şeirinin mahiyyətini özündə əks etdirən müxtəlif formaların yazılı ədəbiyyata gəlişi bu əsrdə daha da güclənir. Təcnis bir forma kimi Qarabağ ədəbi mühitinə çox sürətlə yol tapır. Qasım bəy Zakir müxtəlif vəziyyətlərdə buna müraciət edir.

Ömürlər sərf edib, canlar üzməmiş,
Həmdəm olmaz, ey dil, oturan sana.
Mənzili-məqsədə yetmək istəyən,
Həzrəti-Musa tək o Turan sana.

Sən ağasan, mənəm sənin nökərin,
Dil mürğünə verə bilməz özgə dən:
Dəli könül, umub-küsmə özgədən,
Aləm bilir odur ot  uran sana. (166, 414-415).

Göründüyü kimi, bu şeir cinas üzərində qurulmuşdur. XIX əsrdə aşıq şeirindən klassik ədəbiyyata gələn bu hal özlüyündə düşüncənin zənginləşməsinə səbəb olur. Bir növ bütün mühiti, ümumilikdə Azərbaycan poeziyasını əhatə edir. Məsələn, «Sünbülüstan»da Mücrim Kərim Vardaninin «Qubadadı» cinas qafiyəsi üzərində qurulmuş bayatısı var:

Aşığam, qubadadı,
Dərbənddə, Qubadadı.

Aləm gözələ dönsə,
Yenə meyl Qubadadı (82, 70).

Göründüyü kimi, bu sırf cinas sözlər üzərində qurulmuş bayatıdır. XIX əsr Azərbaycan şeirinin faktıdır. Birinci misra kəmərdədi anlamını verirsə, ikinci yer, dördüncü insan – gözəl mənasında işlənir. Bu yaxınlıq xalq şeirindən süzülüb gələn istiqamətdir. Necə ki, Aşıq Allahverdinin «Qayıtdı» şeirinin təsirini həm aşıqlarda, həm də XIX əsr yazılı ədəbiyyatında Padarlı Abdullada görürük. Eləcə də xalq bayatılarının təsirini Məhəmməd bəy Aşiqdə, Aşıq Pəridə, Kazım ağa Salikdə və başqalarında müşahidə edirik. Bir növ bu nümunələr XIX əsrdə Qarabağ ədəbi mühitində aşıq şeiri ilə klassik üslubda yazmanın sərhədlərinin qarışdığı aydınlaşır. Bu hal Şah Xətaidən başlayıb M.P.Vaqifdə, Ağabəyim Ağabacıda təkrarlanır və son olaraq XIX əsrdə Qarabağ ədəbi mühitinin əsas faktına çevrilir.

Eyni zamanda burada nəzərə çarpan istiqamətlərdən biri də davamlı olaraq məktublaşma, deyişmə ənənəsinin yaşanmasıdır. Artıq bu, Qasım bəy Zakirin şəxsində ictimai məna kəsb edir. Əgər aşıq şeirində, aşıq qarşılaşmasında sənətin, sənətkarın çəkisini yoxlama, pürkamal olmanı bilmə, aşıq adının ucalığını qoruma məqsədi daşıyırdısa (Dirili Qurbani ilə Dədə Yadigarın, Xəstə Qasımla Ləzgi Əhmədin, Aşıq Valehlə Zərnigar xanımın, Şəmkirli Hüseynlə Reyhan xanımın deyişmələri buna nümunədi) XIX əsr Qarabağ ədəbi mühitində bu tamamilə başqa məna kəsb edir. Daha doğrusu, məktublaşma səciyyəsində yeni dəyər qazanır. Məsələn, Qasım bəy Zakirin M.F.Axundova, I.Qutqaşınlıya, C.Nəvaya müraciətləri bu mənada tamamilə başqa səpkidədir. Dövrün ictimai-siyasi vəziyyətini səciyyələndirmək amalına xidmət edir. Bir növ burada ağrıları bölüşmə, qurtuluş yolu arama məqsədi daha çox nəzərə çarpır. Onu da qeyd edək ki, XIX əsr Qarabağ ədəbi mühitini təkcə xalq şeiri üslubu ilə məhdudlaşdırmaq da olmaz. Bu dövrdə klassik ənənədən gələn əruz vəznində yazma bir ardıcıllıqla davam edir. M.P.Vaqif də, M.V.Vidadi də, Ağabəyim Ağabacı da, eləcə də digər sənətkarlar da əruz vəznində şeirlər yazırdılar. Bu, Qasım bəy Zakirdə də davam edir. Təzkirələr, o cümlədən Mir Möhsün Nəvvabın «Təzkireyi-Nəvab» əsəri bu baxımdan kifayət qədər nümunələrlə səciyyələnir. F.Köçərli yazır: «Qəzəliyyata gəldikdə, demək olar ki, Qövsidən sonra Zaqafqaziya şüərası arasında Zakirdən gözəl və xoşməzmun qəzəl yazan olmayıbdır» (75, 409).

Bu, doğrudan da belədir. Qasım bəy Zakir yaradıcılığının rəngarəngliyinin bir hissəsini klassik üslubda yazdığı şeirlər təşkil edir ki, bu məqamda Zakir şeiri

Nizami, Füzuli, Vaqif xəttində birləşir. F.Köçərli də böyük ümumiləşdirmələrin yekunu kimi həmin qənaətə gəlir. Onu da qeyd edək ki, XVIII və XIX əsri təkcə xalq şeiri üslubunda yazan şairlərin yaradıcılığı ilə səciyyələndirmək mümkün də deyil. Burada əsas olan aşıq şeiri tərzinin aparıcılığı xəttidir. Ancaq hər iki üslub bir-birilə bahəm inkişaf edirdi. M.P.Vaqif də, M.V.Vidadi də, Kərbəlayi Səfi Valeh, Abdulla Canızadə, Aşıq Qənbər, Qasım bəy Zakir və digərləri Mir Həmzə Seyid Nigari də daxil olmaqla klassik üslubda şeirlər yaradırdılar. Həmin nümunələr mühitin spesifikasını, sənətkarların yaradıcılıq imkanlarını aşkarlayan bədii faktdır.

Yeri gəlmişkən bir məqamı da qeyd edək ki, Mir Həmzə Seyid Nigari daha çox klassik üsluba, Füzuli ruhuna, təriqət düşüncəsinə köklənən şairlərdəndir. Mənbələr onun haqqında bir qədər az məlumat verir. Daha doğrusu, onun adı yalnız kiçik bir xatırlama ilə verilir: «Bu seyidi – alicənab ki, darayi-elmü ədəb imiş, islami-şərifi Hacı Mirzə Əfəndidir. Qarabağın Zəngəzur uyezdinin Cicimli nam qəryəsində təvəllüd etmiş. Səfahəti – məsərrət ayati – Qarabağda təhsili-kamalat etdikdən sonra Amasiya bələdisinə mühacirət eyləmiş və orada elm və mərifəti sayəsində şöhrəti-tamiyə məzhər olmuş. Əhli-təriqət olmaq həsbilə həqiqət əhlinin hüsni-nəzərlərini qazanmış. Xülasə, sahibi-təbdir» (113, 242).

Bu, məşhur təriqət şeyxi Seyid Nigari haqqında deyiləndir. Qarabağda «təhsili-kamalata» yetişən nəqşbəndi mürşidi haqqında Məhəmmədağa Müctəhidzadə də, Mir Möhsün Nəvvab da elə bir yaradıcılıq faktı verməmişdir. Ancaq yuxarıdakı informasiya özünün mükəmməlliyi, təzkirəçinin bələdliyi ilə xarakterizə olunur. Onun

şeirlərindən isə heç bir nümunəyə rast gəlmirik. Bir məqamı da xatırladaq ki, bu nəqşbəndi mürşidi haqqında Firudin bəy Köçərli kifayət qədər məlumat verir. Onun Qafqazda, Kiçik Asiyada məşhur olmasını, «Divanı»nın «Qeyrət» mətbəəsində Ömər Faiq Nemanzadənin və Cəlil Məmmədquluzadənin 1907-ci ildə çap etdirdiyini qeyd edir. Nəqşbəndi təriqətinin böyük şeyxi Seyid Nigari sözün həqiqi mənasında XIX əsr Qarabağ ədəbi mühitinin ən qüdrətli nümayəndəsidir. Klassik üslubda yazdığı qəzəl, qəsidə, tərcibəndləri ilə M.Füzuli ənənəsinə yaxınlaşırsa, xalq şeiri üslubunda yazdığı nümunələrlə Yunis Əmrə yaradıcılığının davamçısı olaraq mühüm dəyər qazanır:

Eşqin kanı, Qarabağdır məkanım,
Bülbüli-şeydayəm, cənnət yerimdir.
Əvvəl başdan Qaraqaşlı bustanım,
İmdi gülüstanım Qara Pirimdir.

Sinəmə çəkilən qara dağımdır,
Yandıran aləmi gör nə çağımdır.
Qarabağım qanlı qara bağımdır,
Gözlərimdən axan yaş Tərtərimdir (134, 332).

Seyid Nigari şeirlərində bu ruh əvvəldən axıra qədər davamlı olaraq yaşanır. Yurd, torpaq sevgisi, dövrün, zamanın təlatümləri, şair - mürşid narahatçılığı ayrı-ayrı misraların, bütövlükdə şeirin fikir yükünə çevrilir. Müəllif maraqlı bir tərzdə Qarabağı eşqin kanı, cənnət yeri, özünü isə bülbüli-şeyda kimi vurğulayır. Son olaraq: «Qarabağım qanlı qara bağımdır, Gözlərimdən axan yaş Tərtərimdir» deyir. Bu, şairin vətən sevgisi, yurd narahatçılığıdır. Onun başlanğıcı isə Qarabağ xanlığının başına gətirilən müsibətlərdən qoyulmuşdu və həmin dövrün siyasi

probleminin ağırlığı kimi müxtəlif nümunələrdə yaşanırdı. Çünki S.Nigarinin özü də bu proseslərin ağırlığından bir müddət Qazağa, sonra isə oradan da Amasiyaya üz tutmaq məcburiyyətində qalmışdı. O səbəbdən də Qarabağ onun yaradıcılığında tez-tez xatırlanırdı:

Bir qönçeyi-gülün tarimarıyam,
Görüm abad olsun ol Qarabaği.
Bir gözəl kəklikin giriftarıyam,
Şinlik olsun dağı, bağı, ovlağı. (134, 324)

Seyid Nigari Vətən həsrəti motivində sələfi Ağabəyim Ağabacı ilə birləşir. Ancaq onun yaradıcılıq üslubu Qarabağ mühitində tamamilə fərqlilikdə səciyyələnir. Bir növ Əhməd Yasəvi, Yunis Əmrə xəttində müşahidə olunur. Qarabağ ədəbi mühitində XIX və XX əsrin əvvəllərində bu böyük sənətkar qədər məşhurlaşacaq ikinci bir şəxs yoxdur. Biz onun xalq şeiri üslubunda yazdığı nümunələri Vətən, Qarabağ sevgisi timsalında xatırladıq. Ancaq onun daha böyük və zəngin tərəfini əruz vəznində yazılan nümunələr təşkil edir. Böyük təriqət mürşidi kimi Qarabağ, Qazax, Borçalı, Ermənistan və Amasiya tərəflərdə məşhurlaşıb. «Seyid Nigari qədər Azərbaycanda və sonralar Türkiyədə geniş nüfuza malik olan şeyx olmayıb» (134, 6). Məhz bunun nəticəsi idi ki, o, hər zaman təqib olunurdu. Bütün məqamlarda Seyid Nigari Qarabağ ədəbi mühtinin nümayəndəsi kimi böyük dəyər kəsb edir:

Gəlin ey əhli-könül, artıb azarım, eşidin,
Yox rəvacım, kəsilib biinəzarım, eşidin.
Pozulub rövnəqi-gülzari-baharım, eşidin,
Qalmayıbdır tükənib leyli-naharım, eşidin.
(134, 120)

Bu, özlüyündə mühitin ağrıları idi və Seyid Nigari şeirlərində bir ardıcıllıqla yaşanırdı. Şairin yaradıcılığı XIX əsr Qarabağ ədəbi mühitinin rəngarəngliyini ifadə edir. Məhz bütün bunların nəticəsi olaraq F.Köçərli yazırdı: «Qarabağın elmü kamalı ilə mərufü məşhur olan şairlərindən biri də mərhum Hacı Mirhəmzə Əfəndi ibn Mirpaşadır» (76. 142). Bunu onun Azərbaycanda və Türkiyədə böyük müridlər mürşidi olması da aydın şəkildə göstərir. Hətta bu gün də xalq arasında onun şeirləri, ideyaları, təriqət ənənəsi yaşanır. Və çox böyük düşüncə sahibi kimi ədəbiyyatımızı izləyir. Bunların hamısı isə ümumilikdə Qarabağ ədəbi mühitini xarakterizə edərək, mühitin zənginliyini göstərir.

Nə əcəb dövlət imiş seyri-şikari-Qarabağ,
Nə gözəl nemət imiş söhbəti-yari-Qarabağ.
İndi bildim nə imiş vəsfi-həzari-Qarabağ,
Yeridir kim, çəkərəm ahı və zari-Qarabağ. (134, 8)

Bu nümunələr XIX əsrdə Qarabağ ədəbi mühitindəki ümumi mənzərənin ifadəsidir. Klassik üslubun, təriqətçilik ənənəsinin davamı kimi bu əsrdə özünün ən yüksək mərhələsini yaşayır. Bunun kökləri isə daha əski çağların düşüncəsinə, sufizm, hürufizm ideyalarının tüğyan etdiyi orta çağlara gedib çıxır. Bu, Qarabağ ədəbi mühitinin timsalında məsələnin bir tərəfidir. Onun zənginliyində klassik üslubun Şərq poeziyası ənənələrində davamlı olaraq yaşanması var. Bu, Molla Pənah Vaqif, Qasım bəy Zakir, Xurşidbanu Natəvan xəttində açılır. Bütün bunlar XIX əsr Qarabağ ədəbi mühitinin spesifikasına dayanır. Qasım bəy Zakir isə öz təbii rəvanlığı ilə həm xalq şeirində, həm də klassik üslubda kifayət qədər mükəmməl olacaq nümunələr yaratmışdır. M.M.Nəvvab Q.Zakiri belə təqdim edir: «Türk,

fars dilində qəsidə, qəzəl, müxəmməs, dördlüklər yazıb» (130, 49). Onun qəzəlləri də eyni təbin davamı kimi rəvanlıqla görünür:

Sənə hər mətləbi məxfi dedim, ey gül, əyan tutdun,
Rəqibi-ziştkarın aşikar eyibin nihan tutdun. (130, 49)

Klassik üslub Qarabağ ədəbi mühitində bir xətt kimi daşınır və özünün ümumi ahəngi ilə əvvəlki ənənəyə bağlanır. Eyni zamanda, yeni ifadə və çalarlar da qazanır ki, bu da yazarın sənətkarlıq qabiliyyəti ilə bağlı olan məsələdir.

Dün hökm qıldı, qətlimə ol məh şitabilə,
Şad eylədi gədasını bu xoş cavabilə.
Olsun qara yüzü, görəlim, qanlı qəmzənin,
Öldürmədi məni, yenə qoydu əzabilə (130, 50).

Bu zənginliyin bir hissəsində tarixilik, dövrün hadisələrinin özünəməxsusluqla ifadəsi var. «Zakirin qocalıqdan şikayət haqqında müxəmməsi», «Zakirin böyük bəydən təzə təxt istəməsi» adı ilə vurğulanan şeiri bunu bir aydınlıqla ifadə edir. Bunlar mühitin təbii hadisəsi kimi səciyyələnir və qocalıq vaxtının bədii faktına çevrilir. Həmin nümunələr, mühiti öyrənmək, faktları qiymətləndirmək baxımından mühüm dəyərə malikdir. Eyni zamanda sənətkarın şəxsi taleyi ilə bağlı məsələləri də özündə ifadə edir:

Qorxuram çərx mənə zülmi-mükərrər eyləyə,
Ağ qız oğlu Piri tək dillərdə əzbər eyləyə,
Qaralar Şəmmiyə hörmətdə bərabər eyləyə,
Axırı Hatəm ağadan dəxi bədtər eyləyə
Çörü çöp dərməyə də qoymuya halım qocalıq
(130, 53).

Göründüyü kimi, bu nümunə təkcə Q.Zakir yaradıcılığının müxtəlif tərəflərini xarakterizə etmir. Eyni zamanda

onun dövrü, mühiti haqqında da bir sıra informativ faktlara yüklənir. Düzdür, bu şeir birmənalı olaraq şairin qocalıq dövrünün məhsuludur. Insanın qocalıq dövründəki ümumi görünüşü haqqında da təsəvvür yaradır. Zakir həyatının müxtəlif tərəflərini özündə yaşatmaq məqsədini də daşıyır. Digər tərəfdən mühiti ilə bağlı ayrı-ayrı misraların fikir yükü bəzi məqamları aşkarlayır. Bu ruhda Q.Zakir daha çox M.P.Vaqifin son şeirlərini, həyatının son dövrlərini ümumilikdə isə M.V.Vidadi ruhu ilə yaxınlaşır. F.Köçərli bunları xarakterizə edərək maraqlı qənaətlərə gəlir: «Türk qəzəlləri var ki, Füzulinin qəzəllərinə bərabərdir. Müxəmməs və qafiyələri Vaqifinkindən əskik deyil. Amma asarü əşarının cümləsindən artıq əhəmiyyətlisi və məişətimizə münasibətlisi Mirzə Fətəli Axundova, Qutqaşınlı general İsmayıl bəyə, qubernator Mixail Petroviç Kolyubakina, Rəhim bəy Uğurlubəyova, Cəfərqulu xana, Məhəmməd bəy Aşiqə, Mirzə Mehdiyə və qeyri-müasiri olan dost-aşnalarına yazdığı məktublardır».(75, 366) Bu məktublaşmalar ədəbi mühiti səciyyləndirməklə yanaşı mühitdəki zamanın ictimai-siyasi vəziyyətini, sənətkarların şəxsi həyatlarındakı olacaqları da özündə ehtiva edir. F.Köçərli misal gətirdiyi aşağıdakı bənddə, məsələn, Qasım bəy Zakir İsmayıl bəy Qutqaşınlıya yazdığı məktubda onu «Qutqaşın şahbazı», «Şəki tərlanı» kimi səciyyələndirir:

«Bu əhldən mehribanlıq görmədim,
Məgər bizə ola o yandan mədəd,
Qutqaşın tərlanı, Şəki şahbazı,
Sakini-biladi-Şirvandan mədəd». (75, 373)

Bu ruh özlyündə M.Füzulinin «Şikayətnamə»sinə, bir qədər əvvəldə Q.Təbrizinin, Xaqani Şirvaninin müraciətlərinə bənzəyir. Məlum olduğu kimi, X.Şirvani mühitin

əzabları ilə qarşılaşanda kömək üçün Atabəy hökmdarlarına, Misir sultanına bu səpkidə müraciətlər etmişdi. Q.Zakirin müasiri M.F.Axundova, İ.Qutqaşınlıya müraciəti də həmin ənənənin XIX əsrdə təkrarıdı. XIX əsr ədəbi mühiti birinci mərhələdə Cəfərqulu xan Nəva, Məhəmməd bəy Aşiq, Mirzə Həsən Mirzə, Aşıq Pəri ilə səciyyələnir. Bu sənətkarlar arasındakı müxtəlif münasibətlə olan yazışmalar, heç şübhəsiz, ədəbi mühitin yaradıcılıq imkanlarını, zənginliyini xarakterizə edir. Əgər Zakirin İ.Qutqaşınlıya, M.F.Axundova yazdığı məktub dövrün, mühitin ictimai-siyasi vəziyyətini xarakterizə edirsə, Cəfərqulu xan Nəva ilə məktublaşması tamam başqa səpkili, yaxınlıq və tipik olacaq münasibətləri ifadə edir:

Bəylər, nə layiqdi xan qulluğuna,
Bir kəs atlı gedə, piyadə gələ?
İldə bir yol düşər mənim güzarım,
Vay onun halına, ziyadə gələ!

Mundan sonra girən xanın evinə,
Gərək başmaqların soxa cibinə,
Ya keçirə saf otağın dibinə,
Nə isə, mühəyya, amadə gələ. (130, 63)

Göründüyü kimi, bu yazışmalar bir rəngarəngliklə nəzərə çarpır. Burada artıq səmimi münasibətlər, tənə kimi mühitdən gələn bənzərlik müşahidə olunur ki, onun başlanğıcı hələ XVIII əsrdə Kərbəlayi Səfi Valeh, Baba bəy, Abdulla Canızadə, Aşıq Qənbər, Aşıq Səməd arasında olmuşdu. Bunun tarixi isə həm xeyli əvvəllərə gedir və həm də özündən sonra, yəni XIX əsrdə də yaşanır. Cəfərqulu xan Nəva ilə Qasım bəy Zakir arasında olanlar onun bir hissəsidir. Mir Möhsün Nəvvab öz təzkirəsində «Zakir

bəylər bəyi Mirzay Cəfərqulu xanın evində ayaqqabılarının oğurlandığı üçün yazmışdır» başlığı altında verir və buna yaxın olan hadisənin Adıgözəlin də başına gəldiyini vurğulayır. Sonra təzkirədə «Cəfərqulu xan Nəvanın Zakirə cavabı» verilir:

Qasım bəy, adətdir, xan qulluğuna,
Bir kəs atlı gələ, piyadə gedər.
Mən deyiləm, aləmdə var, eldə var,
Belə cüzvi işlər aradə gedər (130, 63).

Bunlar bir istiqamətdə yaxınlığın ifadəsidirsə, digər istiqamətdə yaradıcılıq faktıdır. Yəni ayrı-ayrı sənətkarların yaradıcılıq imkanlarını, bədii düşüncəsinin rəngarəngliyini, mövzu əhatəliliyini ifadə edir. Daha doğrusu, sənətkarların həyatının ayrı-ayrı məqamlarını yaşatmaq xarakteri daşıyır. Məsələn, Məhəmməd bəy Aşiqlə Cəfərqulu xan Nəva, Aşıq Pəri arasında olan şeirləşmələr tipik nümunədir. Bu nümunələr həmin sənətkraların avtobioqrafiyasının müəyyənləşməsində mühüm fakta çevrilir. Mir Möhsün Nəvvabın təzkirəsində bu ardıcıllıqla müşahidə olunur. Bir növ ədəbi mühitin spesifikası kimi əhəmiyyət daşıyır. «Cənab Cəfərqulu xan Aşıq Pəri Maralyana, Pəri isə Cəfərqulu xana yazmışdır» başlıqlı deyişmədə tipik olan bir faktın ifadəsi özünə yer tapır.

**Cəfərqulu xan:**

Sən ey Pəri, mələk pərvərdəsisən,
Həmişə deyirdin: “Biz çakərik ona”.
Nədən ötrü bizdən kənar gəzərsən?
Nə tabe olubsan sərasər ona?

**Aşıq Pəri:**

Nə şayəstə bu sözləri danışmaq,
Büsyardır mərdi-xidmətkar ona.

Saymaq soltanı, xanı, paşanı,
Nə şah bir söz deyər, nə sərdar ona. (130, 66)

Məhəmməd bəy Aşiqin Mirzə Həsənə, eləcə də Mirzə Həsənin cavabı, Mirzə Həsənin Aşıq Pəriyə cavabı eləcə də digər sənətkarlar arasında olan yazışmalar bütövlükdə Qarabağ ədəbi mühitindəki mənzərəni səciyyələndirir. Onu da qeyd edək ki, bu yazışmalar Qarabağ ədəbi mühitində ayrılıqda bir tədqiqatın mövzusudur.

XIX əsrin ortalarına qədər ardıcıllıqla nəzərə çarpan yazışma və deyişmələr təkcə ədəbi mühiti səciyyələndirmir, eyni zamanda ictimai-siyasi mühiti də xarakterizə edir. Bu dövrdə ədəbi mühit qeyd etdiyimiz kimi spesifik zənginləşmələrlə, müxtəlif istiqamətli əlavələrlə müşahidə olunur. Həmin məktublaşma ilk öncə bədii düşüncə üçün ifadə faktı idi. Burada dövrün, mühitin təsvirindən təbiətin füsunkarlıqlarına qədər olan bir rəngarənglik var. Məsələn, Dirili Qurbanın «Bənövşə» rədifli qoşması buna misaldır. Onun kifayət qədər poetik mənalandırılması ilə bağlı folklorşünaslıqda, ədəbiyyat tarixində maraqlı fikirləri var. Həmin ənənəni Mirzəcan Mədətovda da özünəməxsusluqla mənalanması görünür.

Boynu buruq varıb yarın yanına,
Söylə dərdi-dilim yarə, bənövşə.
Üzümə bax, rəngi-ruyum hər nə var,
Ərz etgilən o xunxarə, bənövşə. (130, 75)

XIX əsr Qarabağ ədəbi mühitində bu ruhda yazılmış şeirlər bir silsilə təşkil edir. Onun tipik nümunələrindən birini bir qədər sonra Xurşidbanu Natəvan yaradıb. Bütün bunlar ədəbi prosesdə ənənənin davamlılıq faktı idi və eyni zamanda həmin ruh Aşıq Pərinin yaradıcılığında başqa bir poetik nümunənin ifadəsində təkrarlanırdı. Nümunə üçün

qeyd edək ki, Aşıq Pərinin «Oynaşır» rədifli qoşması o qədər yüksək poetikliklə yaranmışdı ki, onun təsirindən neçə-neçə bədii nümunələr ortaya çıxdı. Bütün bunlar onun əsil yaradıcı istedadı və təsir imkanlarının genişliyi idi:

Dad eylərəm haray naşı əlindən,
Yandı ciyər eşq atəşi əlindən.
Mən nə deyim gözüm yaşı selindən,
Ürküşür sonalar, göllər oynaşır (82, 56).

Maralyandan Şuşaya gələn bu istedadlı şairənin təsirilə onlarla bədii, poetik nümunələr yaranmışdı. «Oynaşır» şeirinin təsirilə yarananlar da bu sıradadı. Mirzə Həsən Mirzənin eyni rədifli şeiri bunun ifadəsidir:

Etdikcə zülfünü Mirzə mükərrər,
Tazələnir ruhu, olur müəttər.
Gülüstanda zülfün kimi müənbər,
Nə süsənlər, nə sünbüllər oynaşır (130, 72).

Əsəd bəy Vəzirovun Aşıq Pəriyə yazdığı şeir də bu rəngarəngliyin ifadəsidir. Bütün bunlar onu göstərir ki, «Aşıq Pəri də öz müasirlərinin mabeynində ən istəkli, əzizə və möhtərəmə bir övrət imiş» (139). Onun XIX əsr Qarabağ ədəbi mühitində kifayət qədər ucalıqla görünən yeri bütün aydınlığı ilə mənbələrdə vurğulanır. Bu ilk öncə müxtəlif müasirləri olan sənətkarların müraciətlərində nəzərə çarpır. Belə ki, Cəfərqulu xan Nəva, Məhəmməd bəy Aşiq, Mirzə Həsən və başqaları Aşıq Pəriyə müxtəlif istiqamətli bir-birindən gözəl şeirlər həsr etmişlər. Həmin nümunələr bir tərəfdən bədiilik baxımından əhəmiyyətlidirsə, digər istiqamətdə dövrün müxtəlif hadisələrini öyrənmək üçün mənbə rolunu oynayır.

Qarabağ ədəbi mühiti daha bir ciddi faktla məclislərin formalaşması ilə də xarakterizə olunur. Ümumiyyətlə XIX

əsrin ikinci yarısında Azərbaycan ədəbiyyatında bir-birinin ardınca maraqlı hadisələr baş verirr. Bunlar daha çox ayrı-ayrı məclislərin formalaşması istiqamətində özünü göstərir. Həmin birliklərdə aşıq poeziyası ilə yanaşı qəzəl (klassik üslub) də inkişafda görünür. Şamaxıda «Beytüs - Səfa», Bakıda «Məcməüş - şüəra», Ordubadda «Əncümənüş-şüəra», Lənkəranda «Fövcül - füsəha», Qarabağda «Məclisi - üns», «Məclisi - fərəmuşan» fəaliyyət göstərirdi. Bu məclislərin öyrənilməsi bir problem kimi aktuallıq daşıyır və dövrün ictimai-siyasi və ədəbi prosesini xarakterizə edir. Eyni zamanda tarixi reallığın, ədəbi prosesin zərurəti kimi təsdiqlənir. Molla Pənah Vaqifdən Qasım bəy Zakirə ondan da Xurşidbanu Natəvana gedən yolun inkişafını aşkarlayır. Tarixi kökləri ilə saray mühitlərindəki vəziyyətə yaxınlaşır. Artıq Qarabağ ədəbi mühitinin zənginləşməyə gedən yolunda bu məclislər müstəsna rol oynadı. Onun ağırlığını isə Xan qızı ləqəbi ilə məşhur olan Xurşidbanu Natəvan öz üzərinə götürdü.

Bir cəhəti də qeyd edək ki, məclislər təkcə ayrı-ayrı sənətkarların orada şeirlərini söyləməsi, müxtəlif bədii nümunələrin qiymətləndirilməsi ilə yekunlaşmırdı, eyni zamanda klassik irsə münasibət də özünə yer tapırdı. Bir növ orada bədii düşüncədən əlavə nəzəri düşüncə də formalaşırdı. «Məclisi - üns» Mirzə Rəhim Fənanın təşəbbüsü ilə Şuşada (1864) yarandı. Müxtəlif sənətkarları öz ətrafına topladı. Artıq bu, Azərbaycan ədəbiyyatının inkişafında spesifik çalarlarla aktuallıq yaradacaq mənzərəni aşkarlayır. Eyni zamanda ədəbi prosesə istiqamət verir.

Şuşada ədəbi prosesin inkişafı ikinci bir ədəbi məclisin yaranmasını zərurətə çevirdi. Onun başında isə XIX əsr ədəbi-nəzəri fikrində öz sözünü deyə bilən Mir

Möhsün Nəvvab dururdu. «Bu ədəbi məclislər bir növ ədəbiyyat məclislərinə çevrilmişdi. Onlarca istedadlı şairlər həmin ədəbi məktəblərdə yetişmiş, ilk şeirlərini bu məclislərdə oxumuşlar» (137, s. 4). Bu məclislər özlüyündə orta çağların Təbrizdə, Gəncədə, Şamaxıda, Bakıda, Ərdəbildə olan mühitlərini xatırladır. Bir növ XIX əsrin ikinci yarısında ənənənin davamı kimi görünür. Bu məclislərin hər biri ətrafına kifayət qədər istedadlı olan şairləri toplaya bilmişdi. Onlar Qarabağ ədəbi mühitində XVIII əsrdən başlayan davamlı inkişafın mabədi kimi görünür. X.Natəvan, M.M.Nəvvab şəxsində yeni ucalıqlar, zənginliklər qazanırdı. Onu da qeyd edək ki, bu məclislər özündən sonrakı ədəbiyyatın inkişafı üçün zəmin yaradırdı. Bütün bunlar Qarabağ ədəbi mühitində Molla Pənah Vaqifdən Mir Möhsün Nəvvaba qədər olan inkişafı xarakterizə edir. Eyni zamanda Mir Möhsün Nəvvabın yaradıcılığı timsalında ədəbi prosesdəki zənginliyi öyrənməyə şərait yaradır.

## 1.2. Qarabağ ədəbi mühiti və «Məclisi-üns»

Qarabağ ədəbi mühitinin təməl daşları çox-çox qədimlərə gedib çıxır. Bu özlüyündə xalqın tarixi qədər qədim səslənir. Bu mühitdə əski dünyanın maddi və mənəvi mədəniyyətinin izləri bu gün də qorunmaqdadır.

Qarabağ ədəbi mühitindən soraq verən mənbə Moisey Kalankatuklunun «Alban tarixi» əsəridir. Bu əsərdə Cavanşirin ölümünə həsr olunmuş ağı mükəmməlliyi ilə maraq doğurur. Eyni zamanda öz dövrünün yaradıcılıq ənənələri haqqında fikir yürütməyə şərait yaradır. Cavanşiri mədh edən, onun böyüklüyünü, qüdrətini, yenilməzliyini ürək yanğısı ilə, həmçinin yüksək sənətkalıqla qələmə alan müəllif dolayısı ilə Qarabağ ədəbi mühitindən soraq verir.

Azərbaycan ədəbiyyatında şifahi qol üzrə XVII əsr intibah dövrü adlandırılır. Məhz bu intibahı Qarabağsız təsəvvür etmək olmaz.

Həmçinin M.P.Vaqifin müasirləri və Qarabağ ədəbi mühitinin yetirməsi olan Kərbalayı Səfi Valeh, Kərbalayı Abdulla Canıoğlu, Qənbər Gülablı, Mirzəcan Mədətov, Aşıq Pəri, Məhəmməd bəy Cavanşir (Aşiq) Zəngilani və s. bu kimi şairlər XVIII əsr Azərbaycan ədəbiyyatının tarixə dönmüş şəxsiyyətləridir. Doğrudur, XIX əsrin 60-cı illərinə kimi Qarabağ ədəbi mühiti sistemli şəkildə, birlik, toplu şəklində inkişaf etməmiş, pərakəndə halda olmuşdur. Ancaq XIX əsrin II yarısından sonra təşkil olunmuş ədəbi məclislər təkcə Qarabağ ədəbi mühiti üçün deyil, bütövlükdə Azərbaycan ədəbi mühiti üçün mühüm rol oynamışdır. Qarabağ ədəbi mühiti məhz bu dövrdə yüksələn xətlə inkişaf etmiş, özünün çiçəklənmə dövrünü yaşamışdır. Bu dövrdə Qarabağ ədəbi mühitində izi olan şəxslərin həyat və fəaliyyəti, ədəbi əlaqələri öz əksini M.M.Nəvvabın

«Təzkireyi-Nəvvab» əsərində tapmışdır. Odur ki, bu əsər ədəbiyyat tariximiz üçün qiymətli məxəzdir.

XIX əsr Azərbaycan ədəbiyyatı tarixində ədəbi məclislər müstəsna əhəmiyyət kəsb etmişdir. Belə birliklər qədim dövrlərdə ədəbi məclis deyil, toplantı, yığnaq adlandırılmışdır. Həmin yığnaqlarda elin müşgül işləri yoluna qoyular, qopuz çalınıb, söz qoşularmış. Odur ki, «Kitabi-Dədə Qorqud» dastanında ozan bilici, dürlü xəbər söyləyən, Tanrıdan ilham alan, elin müşgül işini həll edən, xalq elçisi, peyğəmbər xislətli bir varlıq kimi qiymətləndirilir. Ozan hər bir yığnaqda qopuz çalır, söz qoşur, xalqla birgə yaşayır. Bu yığnaqlar müasir ədəbi məclisi xatırladır. Təsadüfi deyildir ki, «yığnaq» sözü «məclis» sözü ilə sinonimdir. Yuq, yuğ, yuğlamaq, yəni ağlamaq-yığılıb ağlamaq, yuğçu, ağıçı hamısı bir kökdəndir. Həmçinin toplantıya yuğ deyilir. Toplantı, yığnaq, yəni bir yerə cəm olmaq deməkdir. Demək, məclis qurmaq adəti xalqımızın ən qədim dövrlərinə gedib çıxır.

Bu məclislər ədəbiyyatımıza yeni məzmun və forma gətirmiş, klassik irsimizi davam etdirməklə bərabər, xalqın istək və arzularını, ictimai quruluşun eyiblərini də özündə əks etdirmişdir. Ədəbi məclislər şəxsiyyətlərin yetişməsində və bir ideya ətrafında birləşməsində nüfuzlu ədəbi məktəb rolunu oynamışdır.

Xalqımızın kollektiv əməyinin məhsulu sayılan zəngin bədii sənət inciləri – el ədəbiyyatı, tarixən formalaşmış adət və ənənələrimiz imkan verir deyək ki, ədəbi məclislərin tarixi daha qədimlərə gedib çıxır. Məlumdur ki, əmək nəğmələri kollektiv əmək prosesində ifa edilmişdir. Bununla da kollektivi səfərbər etmiş, birliyə səsləmiş və əmək prosesinin ağırlığını yüngülləşdirmişdir. Mərasim nəğmələri də xalqın adət və ənənələri ilə bağlı olaraq təşkil edilmişdir. Yas, dəfn, toy mərasimləri ədəbi məclislərin

rüşeymlərini özündə əks etdirmişdir. Məsələn: toy mərasiminin bir sıra mərhələləri vardır: elçilik, nişanlanma, xına gecəsi, duvaqqapma və s. Bunların hər biri bir ədəbi məclisi xatırladır.

XII-XIV əsrlərdə şairlər arasında deyişmələr və yazışmalar olmuş, kütlənin əsas nəzər diqqətini cəlb etmişdir. Azərbaycanda hakimiyyətdə olan şahların bəziləri şair, yaxud da şair təbiətli olduğu üçün bütün tarix boyu saraylarda şeirə, sənətə yüksək qiymət verilmişdi. Ona görə də ədəbi məclisləri təkcə XIX əsrlə məhdudlaşdırmaq olmaz. Bu məclislər tarixin müxtəlif mərhələlərində müxtəlif şəkildə özünü göstərmiş və nəhayət, XIX əsrdə ictimai-tarixi şəraitlə əlaqədar olaraq ədəbi məclislər şəklində olmuşdur. Eyni zamanda həmin ədəbi məclislər püxtələşib böyük bir ədəbi məktəbə çevrilmişdir. Belə məclislərdən Gəncədə «Divani-hikmət», Qubada «Gülüstan», Ordubadda «Əncümənüş-şüəra», Lənkəranda «Fövcül-füsəha», Şamaxıda «Beytüs-səfa», Şuşada «Məclisi-üns» və «Məclisi-fəramuşan», Bakıda «Məcməüş-şüəra» və bir sıra kiçik ədəbi məclislər geniş fəaliyyət göstərmişlər. Bu ədəbi məclislər bir-biri ilə ədəbi və mənəvi cəhətdən sıx bağlı olmuş, bir məqsədə xidmət etmişlər. Həmin məclislərin ətraflı öyrənilməsi sahəsində xeyli iş görülmüşdür. Məsələn, «XIX əsr Azərbaycan ədəbi məclisləri» mövzusunda mərhum alimimiz Nəsrəddin Qarayev tədqiqat aparmış, namizədlik dissertasiyası yazmışdır. Onun tərtib etdiyi «Poetik məclislər» kitabı ölümündən sonra «Yazıçı»-- nəşriyyatı tərəfindən 1987-ci ildə çap edilmişdir. Onu da qeyd edək ki, nə tədqiqatçı N.Qarayevin göstərilən əsərləri və nə də Qarabağ ədəbi mühitində yetişən ayrı-ayrı şəxslərin haqqında verilmiş məlumat xarakterli yazılar ədəbiyyatımız üçün son dərəcə

maraqlı və mühüm bir sahəni əhatə edən XIX əsr Qarabağ ədəbi mühütini əks etdirmək işində qənabəxş hesab oluna bilməz. Çünki bu mühitlərin, ədəbi məclislərin öyrənilməsi bir tədqiqat (monoqrafiya, dissertasiya və ya məqalə) səviyyəsində çözülməz problemdir. Onun geniş araşdırılması hələ də öz həllini gözləyir. Orada olan problemlərin zənginliyi, üslub rəngarəngliyi və oxşarlıqları, poetika problemləri, mövzu müxtəlifliyi, tarixilik və müasirlik məsələləri genişliyi, əhatəliliyi ilə səciyyələnir. Eləcə də hər bir sənətkarın yaradıcılıq xüsusiyyətləri yeni araşdırmaları zəruri edir.

Məlum olduğu kimi, Qarabağda iki ədəbi məclis («Məclisi-üns və Məclisi-fəramuşan») geniş fəaliyyət göstərmişdir. Hər iki məclis Şuşa şəhərində təşkil edilmişdir. ««Məclisi-üns» («Dostluq məclisi») 1864-cü ildə Şuşada, o dövrün müqtədir alimlərindən sayılan Mirzə Əbdülqasımın mədrəsəsində təşkil edilmişdir. Məclisin ilk təşəbbüsçüləri Mirzə Rəhim Fəna və Hacı Abbas olmuşlar. Ilk vaxtlar məclisin üzvləri H.A.Agəhin mənzilində toplanmışlar. 1872-ci ildə məclis Natəvanın xahişi ilə onun sarayına köçmüş və həmin tarixdən etibarən «Məclisi-üns» adlanmışdır. Əsas üzvləri Hacı Abbas Agəh, Xurşidbanu Natəvan, Mirzə Rəhim Fəna, Məmo bəy Məmai, Mirzə Həsən Yüzbaşov, İsmayıl bəy Dəruğə, Məşədi Nəsir Lövhi, Mirzə Sadıq Imanxan oğlu (Piran), Isgəndər bəy Rüstəmbəyov, Baxış bəy Səbur, Səməd bəy və s. olmuşdur. Ümumiyyətlə, «Məclisi-üns»ün otuzdan çox üzvü varmış. Şairlərlə yanaşı, Qarabağın görkəmli xanəndə və sazəndələri də onun yığıncaqlarında fəal iştirak etmişlər.» (137, 166). «Məclisi-üns» Natəvanın vəfatına qədər (1897) fəaliyyət göstərmişdir. Nəsrəddin Qarayev göstərilən əsərində qeyd edir ki, XIX əsrin ikinci yarısında təşkil

edilən ədəbi məclislər içərisində həm iştirakçıların sayına, həm də başqa ədəbi məclislərlə əlaqələrinə görə «Məclisi-üns» xüsusi yer tutur. Bu məclisin səsi-sədası nəinki Azərbaycan rayonlarına, hətta Tiflis, Təbriz, Tehran, Aşqabad və başqa şəhərlərə belə yayılmışdır. Şamaxıdan S.Əzim, M.A.Bixud, A.Zühuri, Şəkidən İ.Nakam, Bakıdan A.Müniri, Naxçıvandan M.T.Sidqi, Lənkərandan M.I.Qasir Şuşaya – «Məclisi-üns»ün adına məktub yazıb bu yeni ədəbi məclisin üzvlərini təbrik edirlər. (137)

«Məclisi-fəramuşan» ədəbi məclisinin ətrafında «Məclisi-üns»ün üzvlərindən çox üzv toplanmış və hətta «Məclisi-fəramuşan»a bilavasitə rəhbərlik edən Nəvvab hər iki ədəbi məclis arasında dostluğa, yaradıcılıq əlaqələrinə şərait yaratmışdır.

M.M.Nəvvab və X.V.Natəvanın rəhbərlik etdikləri Qarabağ ədəbi məclisləri ümumən Azərbaycan ədəbi prosesində əlamətdar hadisə olmuşdur. Hər iki ədəbi məclisin Şamaxıda, Bakıda, Gəncədə, Lənkəranda, Naxçıvanda və başqa şəhərlərdə ədəbi məclislər və şairlərlə sıx əlaqəsi var idi. Belə bir faktı xatırlatmaq kifayətdir ki, XIX əsr Azərbaycan şeirinin klassiki S.Ə.Şirvaninin Qarabağ şairlərindən Asiyə, Növrəsə, Natəvan və başqalarına aid ondan artıq dərin mənalı şeiri vardır. «Məclisi-üns» və «Məclisi-fəramuşan» ədəbi məclisləri Qarabağda mütəşəkkil tərzdə fəaliyyət göstərmiş, varlı və kasıb olmasından asılı olmayaraq ətrafına çoxlu sənət adamı toplamış (ən çox bu xüsusiyyət «Məclisi-fəramuşan» ədəbi məclisinə aiddir) bir növ demokratik yaradıcılıq birliyi şəklində böyük uğurlar qazanmışdır.

«Məclisi-üns» ilə «Məclisi-fəramuşan» ədəbi məclisləri arasındakı ideya-estetik əlaqənin vəhdətini göstərən amillərdən biri Nəvvabla Natəvan arasındakı ədəbi əlaqədir. Ümumiyyətlə, Nəvvabın Qarabağ şairləri ilə yaradıcılıq

əlaqələri geniş bir tədqiqatın mövzusudur. Biz isə bunu ümumi yanaşma müstəvisində xatırladırıq. Məlum olduğu üzrə, 1892-ci ildə «Təzkireyi-Nəvvab» əsərini yazmağa başlayan Nəvvab öz müasirlərinə müraciət edərək kitaba daxil etmək məqsədilə onlardan avtoqraflarını istəmişdir. O cümlədən Nəvvab həm Natəvana, həm də Fatma xanım Kəminəyə də müraciət etmişdir. Lakin təvazökarlıq edən bu iki şairə Nəvvaba cavabı gecikdirdikdə Nəvvab onlara şeirlə təkrar məktub göndərmişdir.

Bu məclislərdə iştirak edənlər ədəbiyyatımızın mütərəqqi qolunu təşkil etmiş, onun maarifçi demokratik, milli intibahına bu və ya digər dərəcədə ciddi kömək göstərmişlər. Məclis üzvlərinin əksəriyyəti iki dildə – Azərbaycan və fars dillərində yazmışlar. Nəvvab isə üç dildə Azərbaycan, fars, ərəb dillərində yazıb yaratmışdır. Həmçinin özbək şairi Ə.Nəvainin həvəslə öyrənilməsi nəticəsidir ki, A.Asi çığatay dilində də gözəl qəzəl yaratmışdır. Istər «Məclisi-üns», istərsə də «Məclisi-fəramuşan» üzvləri klassik irsi yaşatmaqla bərabər yeniliyə meyl göstərir, öz əsərlərində maarif, azadlıq məsələlərinə toxunur, dövrün mövcud mənfi qayda-qanunları əleyhinə çıxır, fanatik din xadimlərini, haqsızlığı, özbaşınalığı tənqid edirlər.

Qarabağ ədəbi mühitində pərvəriş tapan XIX əsr şairləri şeirlərini klassiklərin və xalq ədəbiyyatının təsiri ilə yazmışlar. Odur ki, bu dövrdə şeir klassik üslubda, yəni əruz vəznində və xalq şeiri üslubunda, yəni heca vəznində yazılmışdır. Heca vəznində M.M.Nəvvab, Mirzə Məhəmməd Katib, Məşədi Əyyub Baki, Həsənəli xan Qaradaği, Bəhrəm bəy Fədai, Nəcəfqulu bəy Şeyda və başqaları gözəl şeirlər yaratmışlar. Mirzə Məhəmməd Katibin «Içində», «Nə dedi», «Gəlməsin», «Gözlərin»,

«Ağlasın», «M.F.Axundova» və s. şeirləri heca vəznində yazılmış ən gözəl nümunələrdir. Mirzə Məhəmməd Katibin «Gözlərin» qoşmasından bir parçaya diqqət yetirək:

Səhər-səhər durub qıya baxanda,
Düşgünüyəm mən o ala gözlərin.
Badə nə lazımdı, sevdiyim, mənə,
Məst eyləyib o piyalə gözlərin.

Qəmzeyi-cəlladın nə xunxar imiş,
Canım alan, bəlli sitəmkar imiş,
Bu zalımda nə fitnələr var imiş!
Salar məni haldan-hala gözlərin. (130, 132)

Sənətkarlıq cəhətdən yüksək qiymətə layiq olan bu şeirdə qoşmaya xas olan bütün ünsürlər özünü göstərir. Hər bir əsrdə şairə və şeirə yüksək qiymət verilmiş, onun məqamı göstərilmiş, qarşısına müəyyən tələblər qoyulmuşdur. XII əsrdə yaşayıb-yaradan şair Əfzələddin Xaqani (1126-1199) ümumiyyətlə şair haqqında demişdir: «Hər bir tərbiyəçi şairliyi bacarmaya bilər, lakin hər şair tərbiyə verməyi bacarmalıdır» (27, 6).

## 1.3. M.M.Nəvvabın Qarabağ ədəbi mühitində yeri və "Məclisi-fəramuşan"

Görkəmli şəxsiyyətlər yetişdirən Qarabağ ədəbi mühitinin böyük simalarından biri də Mir Möhsün Mir Əhməd oğlu Nəvvabdır. XIX əsrdə yaşayıb yaradan böyük alim, şair, mahir rəssam, gözəl təzkirəçi, naşir və tanınmış təşkilatçı müəllim Mir Möhsün Nəvvab özünəməxsus yüksək keyfiyyətləri ilə səciyyələnən şəxsiyyətlərdən olmuşdur. Nəvvab Qarabağda Natəvandan sonra ən böyük şəxsiyyət hesab olunur və hətta çoxşaxəli yaradıcılığı ilə daha çox diqqəti cəlb edir. «Qarabağlı Mir Möhsün Nəvvabın (1833-1918) təşəbbüsü ilə «Məclisi-fəramuşan» və ya «Məclisi-xamuşan» adı ilə ikinci bir ədəbi məclis təşkil edildi. Onun rəhbəri Mir Möhsün Nəvvab köhnə təhsil almasına baxmayaraq ədəbi və pedaqoji fəaliyyətində yeniliyə meyl edirdi. Məclis üzvlərini dünya hadisələri və mədəni yeniliklərlə tanış etmək üçün Nəvvab Bakıdan «Əkinçi», Tiflisdən «Ziya» və «Kəşkül» qəzetlərini, Hindistanda fars dilində nəşr olunan «Həblül-mətin» məcmuəsini alırdı… Məclisin üzvləri həm bir-birilə, həm də «Məclisi-üns»ün üzvlərilə şeirləşirdilər. «Məclisi-üns»dən əlavə, «Məclisi-fəramuşan» Şamaxıdakı «Beytus-səfa» məclisi ilə də əlaqə saxlayırdı. Hər iki məclis arasında 70-ci illərdə qızğın şeirləşmə gedirdi». (25, 159).

Nəvvab dövrünün bütün biliklərinə sahib geniş qavrayışı və məhsuldar fəaliyəti ilə, XIX əsr Qarabağ ədəbi mühitində, öz yoldaşları arasında görkəmli yer tutmuşdur. Məşədi Əyyub Baki 1311-ci ildə (hicri) Nəvvab haqqında yazmışdır:

Ey qüdrətli və xeyirxah cənab,
Sənsən ali nəslin başının iftixar tacı...

Kimdir Ənvəri, Sədi, Hafiz, Hatif,
Bilmirəm kimdir, Növrəs, Müştəri, Muxtar?!
Səadət göylərinin hüması bizə Nəvvabdır. (130, 252)

Mirzə Muxtar, Növrəs, Abış bəy, Fatma xanım Kəminə və b. Nəvvab haqqında şeirlər yazmış, onu «ali ustad», «səadət zirvəsinin humayı» adlandırmışlar.

M.M.Nəvvabın «Yoxdur ürəyimin evində yardan başqa kimsə» şeirinə Abış bəy, Məşədi Əyyub Baki, Şaki Molla Xəlil Abdal, Fatmeyi Kəminə və b. bənzətmələr, «Aşıq oldum nagəhan bir şux bipərvayə mən» misrası ilə başlayan qəzəlinə isə Abış bəy, Baki, Fatma xanım Kəminə və b. nəzirə yazmışlar. Deməк, Nəvvab hələ öz dövründə yüksək qiymətləndirilmiş, bir ustad kimi nəinki Qarabağ ədəbi mühitində tanınmış, eləcə də bütün Azərbaycanda məşhur olmuşdur. Onun Azərbaycan, Zaqafqaziya, Rusiya, Iran, Türkiyə və başqa coğrafi miqyası əhatə edən marağı, publisist fəaliyyəti ilə əlaqədardır. O, M.F.Axundov, H.Zərdabi, M.Şaxtaxtinski, C.Məmmədquluzadə kimi, nəşriyyat və dövri mətbuatın xalq üçün əhəmiyyətini son dərəcə yüksək qiymətləndirirdi. Həsən bəy Zərdabi, Seyid Əzim Şirvani, Mirzə Rzaxan Daneş, Adolf Berje və bir çox görkəmli qələm sahibləri «Ziya» qəzetində çıxış edirdilər. Onların arasında Nəvvab mühüm yer tuturdu. O, Nizami, Xaqani, Füzuli, Vaqif poeziyasını dərin məhəbbətlə öyrənmiş və onlardan yaradıcılıqla istifadə etmişdir. Firdovsi, Sədi Şirazi, Hafiz Şirazi və başqa Şərq klassiklərini də gözəl bilirdi. Odur ki, o, farsca divanında Firdovsi, Hafiz, Firuğinin təsiri ilə şeirlər yazmışdır.

Nəvvabın Qarabağ ədəbi mühitində tutduğu mövqeyi daha dərindən aşkarlamaq üçün onun həyat və fəaliyyətinə nəzər salmaq, yaradıcılıq istiqamətlərini öyrənmək vacib və məqsədyönlüdür. Çünki M.M.Nəvvabın elmi-bədii irsi onun

müasiri olduğu ədəbi mühit kontekstində daha aydın şəkildə açılır.

Qarabağda geniş şöhrət tapan, böyük əhəmiyyət kəsb edən ikinci məclis məhz M.M.Nəvvabın yaratdığı «Məclisi-fəramuşan» olmuşdur. «Poetik məclislər» kitabında bu məclis haqqında da məlumat verilmişdir: – «Məclisi-fəramuşan» («Unudulmuşların məclisi»), 1872-ci ildə, «Məclisi-üns» Natəvanın sarayına köçdükdən sonra Mir Möhsün Nəvvabın təşəbbüsü ilə təşkil edilmişdir. Üzvləri isə «Məclisi-üns»ün «Fəramuş etdikləri (unutduqları) şairlər olmuşdur».(137, 238). Göründyü kimi, «Məclisi-üns» bir sıra şəxsləri unutmuş «Məclisi-fəramuşan»ın yaranması üçün zəmin olmuşdur.

Ədəbi məclislərin əhəmiyyəti, vacibliyi ondadır ki, bir sıra şəxsiyyətlərin üzə çıxarılması, ədəbi nümunələrin dürüstləşdirilib, düzgün ünvanlanması və həmçinin öz dövrü üçün istedadların bir yerdə cəmlənməsi, qabiliyyətlərinin daha da püxtələşdirməsi üçün əsas şərtdir. Orada natiqlik məharətinin nümayiş olunması istedadlı natiqlərin şəxsində böyük əhəmiyyət kəsb etmişdir. Bu baxımdan «Məclisi-fəramuşan» ədəbi məclisinin öyrənilməsi və araşdırılması ədəbiyyat tarixinin dürüstləşdirilməsi və Qarabağ ədəbi mühitinin unudulmuş bir sıra şəxsiyyətlərinin üzə çıxarılması üçün böyük əhəmiyyətə malikdir.

XII əsrdə dahi Nizami Gəncəvi şairə və şeirə yüksək qiymət verərək şairi «ərşin bülbülü» adlandırır. Onu peyğəmbərə bərabər tutaraq, pulpərəst, yaltaq, şeirin şərəfini alçaldanları ifşa etmişdir:

O kəslər ki, ölüb əldən gedirlər,
Sözünsə sikkəsini qızılla məhv edirlər…
Bir sözlə, bu pulpərəst, küt şairlər ki, vardır,
Yüksək yer tutsalar da alçaq adamlardır. (27, 9)

XIX əsr Qarabağ ədəbi məclislərində fəaliyyət göstərən şairlər qarşısında da eyni tələblər qoyulur və şeirin böyük hikmət olduğu göstərilir. Biz bunu Mehdiqulu xan Vəfanın (1856-1900) aşağıdakı şeirindən aydın görə bilərik:

Ol deyil şair ki, şeirin ehtiramın bilməyə,
Dəvayi-şeir eyləyə, amma məqamın bilməyə,
Pul təmənnasilə şeirin ərz edə hər nakəsə,
Küçələrdə xar olub, öz nəngü-namun bilməyə.
Şeir hikmətdir, bəsi alidi qədri şairin
Heyf ola şair əgər qədrin, kəlamın bilməyə.

(113, 233)

Beləliklə, ilk baxışda ədəbi məclis üzvlərinin ədəbi nümunələri zəif, nöqsanlı, ideyasız kimi görünə bilər, lakin yuxarıda göstərilən tələblərə cavab verə bilən, tarixi sənəd kimi püxtələşən, XIX əsrin qaranlıq səhifələrini işıqlandıran hər bir ədəbi nümunə bu gün bizim üçün qiymətli ədəbi-tarixi bir məxəzdir. Belə inciləri üzə çıxarmaq isə hər birimizin müqəddəs borcudur.

M.Möhsün Nəvvabın «Təzkireyi-Nəvvab» (130), M.Müctəhidzadənin «Riyazül-aşiqin» (113), Nəsrəddin Qarayevin «Poetik məclislər» (137) kitabına və başqa əsərlərə istinadən «Məclisi-fəramuşan» üzvlərinin siyahısını aşağıdakı şəkildə təsəvvür etmək mümkündür: Mir Möhsün Nəvvab (1833-1919), Abdulla bəy Asi (1839-1874), Həsənəli xan Qaradaği (1847-1929), Mirzə Əbdül Şahin (?-1883), Məşədi Əyyub Baki (1866-1909), Fatma xanım Kəminə (1840-1893), Abdulla bəy Abış (?), Baxış bəy Səbur (1863-1929) və qardaşı Bayram bəy Fədai (?), Mirzə Muxtar (1826-1912), Məşədi Məhəmməd Bülbül (1866-1915), Molla Xəlil Şaki (?), Mirzə Məhəmməd Katib (1833-1888), Xarrat Qulu Yusifi (1823-1883), Mirzə Hüseyn Salar (?-1878), Mirzə İsmayıl Məhzun (1821-1898), Mirzə Əli

Aşiq (1846-1900), İbrahim bəy Azər (1830-1850), Məşədi Cəfərqulu (?-1896), Mehdi bəy Mirzə Camal oğlu (?-1887), Hacı Əmir (?-1887), Kərbəlayi Ələkbər Safi (?), Mirzə Sadiq Lətif oğlu Hicri (Təbib), Mirzə Sadıq Imanxan oğlu, xanəndələr Məşədi Isi, Hacı Hüsü, Sadıqcan və başqaları. Heç bir elmi mənbədə (Azərbaycanın digər şəhərlərində mövcud olan ədəbi məclislər kimi), «Məclisi-fəramuşan» üzvlərinin tam siyahısı mövcud deyildir. Məclis üzvlərini ayrı-ayrı şairlərin şeirlərindəki ünvanlardan, onların digər şəhərlərdəki şairlərlə məktublaşmalarından və bu kimi başqa yollarla müəyyənləşdirmək mümkündür.

Mir Möhsün Nəvvab fars dilində olan divanında qeyd edir ki, Məşədi Cəfərqulu Kərbəlayi İbrahim oğlu, «Tarixi-Qarabağ»ın müəllifi Mirzə Camalın oğlu Mehdi bəy və Hacı Əmir məşədi Əli oğlu da «Məclisi-fəramuşan»ın üzvü olmuşlar.

M.M.Nəvvabın rəhbərlik etdiyi «Məclisi-fəramuşan»ın ən fəal üzvlərindən biri Həsənəli xan Qaradaği olmuşdur. Bu Nəvvab «Təzkirə»sində də öz parlaq əksini faktlarla tapmışdır. H.Qaradaği məclisin demək olar ki, bütün yığıncaqlarında fəal iştirak edirdi. Bu səbəbdən də M.M.Nəvvab H.Qaradağiyə dərin hörmət bəsləyir, onun çoxsahəli fəaliyyətini yüksək qiymətləndirirdi.

H.Qaradağinin ədəbi irsi qəzəl, qəsidə, müxəmməs, müstəzad və uşaqlar üçün yazılmış çoxlu miqdarda kiçik həcmli tərbiyəvi nəsihətamiz şeirlərdən, Krılovdan etdiyi tərcumələrdən ibarətdir. O, Qarabağ tarixi ilə maraqlanmışdır. 1880-ci ildə Mirzə Adıgözəlbəyin «Qarabağnamə»sinin üzünü köçürmüşdür. Sonralar onun özü də «Qarabağ tarixi» əsərini yazmışdır. Azərbaycan Respublika Əlyazmalar Institutunda həmin əsərdən bəhs olunan

fraqmentlər «Qarabağnamə»lərin II cildinə daxil edilmişdir (87).

Xurşidbanu Natəvanın «Ağlaram» rədifli şeirinə bir çox bənzətmələr yazılmışdır. Həmin bənzətmələrdən birinin müəllifi «Məclisi-üns»ün üzvü Mirzə Rəhim Fəna idi. Onun səsinə «Məclisi-fərəmuşan»ın üzvü Həsənalı xan Qaradaği cavab verərək, öz şeirini Mirzə Ələsgər Növrəsə xitabən yazmışdır:

Yox məndə səbr firqəti-cananə, ağlaram,
Düşdüm dedim bu atəşi-hirmanə, ağlaram… (137, 313)

Növrəs dostu H.Qaradağinin bu şeirini cavabsız qoymamış və ona xitabən yazmışdır:

Səbr eylə cövrü-firqəti-cananə ağlama,
Salma özün bu atəşi – hirmanə, ağlama… (137, 195)

M.M.Nəvvabın rəhbərlik etdiyi ədəbi məclisin məşğələləri, əsasən, gecələr keçirilirdi. Təbii ki, məclis üzvləri müxtəlif peşə sahibləri idilər. Onlar gündüzlər kəsbkarlıq etdiklərindən ədəbi məclislərin yığıncağını gecələr davam edə bilirdilər. Mir Möhsün Nəvvabın ən yaxın dostu yuxarıda deyildiyi kimi «Məclisi-fərəmuşan»ın fəal üzvlərindən biri istedadlı şair və pedaqoq Həsənəli Xan Qaradağidir. Onun babası Məhəmmədhəsən ağa 1806-cı ildə cənubi Azərbaycanın Qaradağ mahalından köçüb Şuşaya gəlmişdir. Burada o, rus ordusunda qulluğa girmiş və polkovnik rütbəsinə qəbər yüksəlmişdir. Göründüyü kimi, ata-babası Cənubi Azərbaycanın Qaradağ mahalından olan Həsənəli xan 1847-ci ildə hərbi xidmətçi ailəsində anadan olmuşdur. Hələ ana bətnində ikən atası vəfat etdiyi üçün anası Həsənəlinin adını oğluna qoymuşdur. Onun ailə üzvləri və qohumları Həsənəli ağanı xatırlayaraq həmişə onu «Balaca ağa» - deyə çağırarmışlar. O, Şuşanın yaşlıları arasında həmin adla da məşhur olmuşdur. Atasının vəfatından sonra

dünyaya göz açan Həsənəli əmisi Məhəmmədhüseyn ağanın himayəsində böyümüşdür. Əmisi balaca Həsənəlini yeddi-səkkiz yaşında Şuşada qəza məktəbinə qoymuşdur. O, həmin məktəbdə rus dilini öyrənir. Məhəmmədhüseyn ağa tezliklə Tiflis şəhərinə köçür. Anası Xatun xanım da Qubadlı rayonunun sakini (Hal kəndi) Xəncan bəyə ərə gedir. Istər əmisindən, istərsə də anasından vaxtlı-vaxtında yardım ala bilməyən Həsənəli Şuşa qəza məktəbində çətin maddi-mənəvi şəraitdə oxuyur. O, boş vaxtlarını mütaliə ilə keçirir. Çox maraqlıdır ki, Həsənəli cəmi on altı yaşında Şuşanın təzə məhəlləsində bir ev kirəyə edərək müstəqil yaşamağa başlayır. O, yalnız anasından cüzi maddi yardım alırdı. Rus məktəbində (Şuşa Qəza məktəbində tədris rus dilində idi) oxuya-oxuya Şuşa rus-tatar məktəbinin müəllimi Bəşir Yusifzadənin atasından ərəb-fars dillərini öyrənirdi. Şərq klassiklərini mütaliə edirdi. Ədəbiyyata ciddi maraq göstərir, ara-sıra lirik şeirlər də yazırdı. XIX yüzilliyin 60-cı illərinin sonuna doğru Həsənəli Xan Qaradaği Şuşa əhalisi arasında savadlı, istedadlı bir maarifpərvər, həm də şair kimi tanınmağa başlayır. Təxminən 1868-ci ildən H.Qaradaği müəllimlik fəaliyyətinə başlayır. Onun Şuşa şəhərindəki bu ilk məktəbdarlığı 1873-cü ilə kimi davam etmişdir. Həmin məktəbdə tədris etdiyi sadə vəsaitləri də özü tərtib edirdi. O, mühiti nəzərə alaraq öz şagirdlərinə Quran ayələrini və namaz qaydalarını da öyrədirdi. H.Qaradaği XIX əsrdə Azərbaycanın M.T.Sidqi, S.Ə. Şirvani, M.M.Nəvvab kimi yeni tipli maarif və mədəniy-yət carçısı olduğundan onun pedaqoji fəaliyyəti xüsusi tədqiqata möhtacdır… H.Qaradağinin nəsihətamiz, sati-ra və yumorla yoğrulmuş mənzum hekayələri XIX əsrin ikinci yarısında Azərbaycan ədəbiyyatının realist üslub-da yazılmış nümunələrindən olmaq etibarı ilə çox əhə-

miyyətlidir. Uzun müddətli ədəbi və pedaqoji fəaliyyətini nəzərə alan Azərbaycan Xalq Maarif Komissarlığı ona xüsusi təqaüd təyin etmiş və şair ömrünün sonuna-dək (1929) həmin təqaüdü almışdır…

H.Qaradaği geniş ədəbi-ictimai əlaqələrə malik idi. O, Ismayıl bəy Qaspirinski, Cəlal Ünsizadə, Cəlil Məmmədquluzadə kimi bir çox görkəmli jurnalist və qələm sahibləri ilə əlaqə saxlamışdır. Maarifpərvər şair-pedaqoq «Məclisi-fəramuşan»ın fəal üzvü, M.M.Nəvvabın ən yaxın dostu Həsənəli xan Qaradaği 1929-cu il dekabr ayının ikisində 82 yaşında ikən Şuşada vəfat etmişdir.

M.M.Nəvvabın yaxın dostlarından biri də «Məclisi-fəramuşan»ın fəal üzvü şair Mirzə Məhəmməd Məşədi Bayram oğlu Katibdir. O, 1833-cü ildə Şuşada yoxsul bir ailədə anadan olub, ilk təhsilini mollaxanada almışdır. Təbiətcə çox sadəlövh, lakin təmiz qəlbə malik olan şair hər deyilənə tez inandığından hətta şəriətin yolvermədiyi bəzi şeylərə də inanıb laqeydlik göstərirdi. Katib yoxsul və sufiyanə bir həyat keçirmişdir. Şair həmişə ehtiyac içində yaşasa da gözü tox və sakit həyat sürmüşdür. Maddi çətinliklər onun şeirlərində də öz əksini tapmışdır. O, dostu Mirzə Fətəli Axundova göndərdiyi bir məktubunda deyirdi:

Ey sərvərim, əhvalımı soruşsan,
Gecə-gündüz işim ahü-zardır.
Könlüm qana döndü bu zəmanədə,
Ol səbəbdən belə biqərardır.

Dərdü-qəmdən qəddim yayə dönübdür,
Rəngim sarı kəhrəbayə dönübdür,

Vücudum bir müqəvvayə dönübdür,
Görən deyər: «surəti-divardır». (137, 284)

Mirzə Məhəmməd Katib haqqında ilk məlumatı verən M.M.Nəvvabdır. M.M.Nəvvab «Təzkireyi-Nəvvab» əsərində Mirzə Məhəmməd Katibin iki min beytə qədər şeiri olduğunu qeyd etmişdir. M.M.Katib M.F. Axundovla sıx dostluq etmişdir. O, Tiflisdə Mirzə Fətəli ilə görüşmüş, onun məclislərində olmuşdur. Şair Mirzə Fətəliyə xitabən «Ey sərvərim, əhvalımı soruşsan» misrası ilə başlayan şeirində yazırdı:

Oxşatmışdın məni əhli-xəvasə,
Tiflisdə çağırdın məclisi-xasə.
Xəyalət istədin məndən, xülasə,
Cənabın əşarə xiridardır. (137, 284)

Həmin məktubdan görünür ki, M.M.Katib M.F. Axundovun tapşırığı ilə öz şeirlərindən ibarət «yaxşı bir kitab» tərtib etmişdi. Təsadüfən həmin əlyazma kitabı arxa düşüb axdığı üçün onu dostu Mirzə Fətəliyə göndərə bilməmişdir.

M.M.Katib şeirlərinin dil sadəliyi, oynaqlığı, axıcılığı və musiqililiyi onun incə zövqünü, həm də mükəmməl sənət yolu keçməsini göstərir. Təəssüf ki, xalq şeirləri üslubunda şeirlər yazan şairin əsərləri itib batmış, az bir hisssəsi bizə gəlib çatmışdır. O, «Məclisi-fəramuşan»ın fəal üzvlərindən biri olmaqla yanaşı, öz müasirlərinin də hörmət və nüfuzunu qazanmışdır. Mirzə Məhəmməd Katib 1899-cu ildə Şuşa şəhərində vəfat etmişdir.

XIX əsrin ikinci yarısında Şuşa ədəbi mühitinin istedadlı şairlərindən biri də Abdulla bəy Asi Əlibəy oğlu Fuladovdur. O, M.M.Nəvvabın yaxın dostu, həm də «Məclisi-fəramuşan»ın fəal iştirakçılarındandır. Görkəmli ədəbiyyatşünas Firidun bəy Köçərli yazırdı ki, «…bütün Qarabağ ürəfavü üdəbası onun vücudu ilə iftixar edərdi. Təbi-şeiriyyəsinə gəldikdə, demək olar ki, cəddi-büzürkvarı Qasım bəy Zakirin təbinə bərabər onun təbi vardı və lakin

Asinin təbi Zakirinkindən xeyli səri və yeyin idi. Abdulla bəyin… kəlami-xoşməalı həm mənən və həm də fəsahətcə cəmi-müasirinin əsərlərindən mümtaz olub, bəlkə Füzuli əleyhirrəhmənin qəzəlindən dəxi bir az artıq ola». (76, 104).

Qasım bəy Zakirin nəvəsi olan Abdulla bəy Fuladov Asi 1841-ci ildə Şuşada anadan olmuşdur. O, təlim-tərbiyəsini də Şuşa şəhərində almışdır. Asi ana dilindən əlavə ərəb, fars, rus dillərini, eyni zamanda böyük özbək şairi Əlişir Nəvaini mütaliə etmək yolu ilə cığatay dilini də müstəqil öyrənmişidi. Abdulla bəy Asi fitri istedad sahibi idi. Onun şeir yazmağa xüsusi zövqü olduğundan əlinə qələm aldıqda söz, misra, qafiyə, obrazlı ifadə seçmək üçün çətinlik çəkməzdi. Şeirlərində həm texniki baxımdan, həm də mənaca qüsur tapmaq çətindir. Bu səbəbdən onun hər dəfə «Məclisi-fəramuşan»da şeir oxumağı xüsusi bir rəğbətlə qarşılanardı.

Təəssüf ki, Abdulla bəy Asi çox qısa, cəmi 35 il ömür sürmüş və 1876-cı ildə Şuşa şəhərində vəfat etmişdir. O, öz dərin məzmunlu və keyfiyyətli qəzəlləri ilə az bir zamanda nəinki Şuşada, həm də Şəki, Şirvan, Bakı, Qazax mahallarında müqtədir şairlərin hörmətini, hüsn-rəğbətini qazanmışdı. Abdulla bəy Asi «Məclisi-fəramuşan» yığıncaqlarında təxminən beş ilə yaxın iştirak etmişdir. Bu qısa müddət ərzində o, Mir Möhsün Nəvvabdan sonra məclisin ən güclü şairi kimi rəğbət qazanmışdı. Abdulla bəy Asini həmin beş illik mərhələdə «Məclisi-fəramuşan»ın canı və ruhu hesab etmək mümkündür. Məclisin bir çox ədəbi və elmi müzakirə və mübahisələrində məclis üzvləri ona müraciət edir, fikir və mülahizələri ilə hesablaşardılar.

Belə bir fakt ədəbiyyyat tariximizdə mövcuddur ki, Seyid Əzim Şirvani kimi nüfuzlu bir şəxsiyyət Şamaxı şairlərinin bir qrupunun yazdığı qəzəllərə qiymət qoymaq

üçün Şuşaya «Məclisi-fəramuşan»a Abdulla bəy Asinin ünvanına göndərirdi. Şuşa ədəbi mühitinin Natəvanla yanaşı yetirdiyi ikinci istedadlı bir şairə Fatma xanım Kəminə idi. M.M.Nəvvab Kəminəyə son dərəcə böyük ehtiram bəsləmiş və onu «Məclisi-fəramuşan»ın ən dəyərli üzvü, məclisin fəxri hesab etmişdir. Həqiqətən də Kəminə öz istedadı ilə Qarabağ şairləri arasında böyük şöhrət qazanmışdır. O, 1841-ci ildə Şuşa şəhərində annadan olmuşdur. Şairənin atası Fəna təxəllüsü ilə şeirlər yazan Mirzə Bəybaba Aslan Qaradağın Körnərud qəsəbəsindəndir. Onun babası vaxtilə (XVIII əsrin sonunda) Qaradağdan Qarabağa köçüb gəlmiş Ibrahim Xəlil xanın oğlu Məhəmmədhəsən ağanın sarayında mirzəlik etmişdir… (79)

Fatma xanım Kəminə təlim-tərbiyəsini Şuşa şəhərində almışdır. Özünün ədəbiyyata olan marağı, şəxsi mütaliəsi və Qarabağ ədəbi mühiti onu şeir yazmağa həvəsləndirmişdir. Azərbaycan və fars dillərində yazdığı lirik şeirləri tezliklə Qarabağ şairlərinin diqqətini cəlb etmişdir.

Vaxtilə Mirzə Rəhim Fənanın hörmət əlaməti olaraq Natəvana cavabən yazdığı «Ağlaram» şeirinə əks-səda verənlərdən biri də Fatma xanım Kəminə olmuşdur. Qarabağın bir çox şairləri Natəvanın «Ağlaram» rədifinə «Ağlama» rədifi ilə cavab yazdılar. Lakin Kəminə qadın ruhunun kövrəkliyi ilə bağlı olaraq Natəvana «Ağlasın» rədifi ilə cavab şeiri yazmışdır. Mir Möhsün Nəvvabla Fatma xanım Kəminənin «Məclisi-fəramuşan»la əlaqədar yaradıcılıq ünsiyyəti xüsusi bir tədqiqatın mövzusu ola bilər. Nəvvab «Təzkireyi-Nəvvab»əsərini yazmaq üçün başqa şair dostları kimi Kəminədən də avtoqraf istəmişdi. Lakin təvazökarlıq edən Kəminə öz şeirlərini Nəvvab «Təzkirə»sinə layiq bilmədiyini yazmışdır:

Təfaxür eylərəm kim, qabili-dəftər olub şeirim,

Mənim də yazdığım sözlər ki, əşarə qərin olmuş.
(130, 273)

Bir çox mənbələrdə Kəminənin «Məclisi-üns»ün də üzvü olduğu söylənilir. Bəzən də onun «Məclisi-fəramuşan»a şəxsən gəlməyib, yalnız öz şeirlərini göndərdiyi ehtimal olunur. Halbuki bu iddiaların heç bir elmi əsası yoxdur. 1894-cü ildə Fatma xanım Kəminə Məşhəd ziyarətindən Şuşaya qayıtmışdı. Bu münasibətlə Nəvvab ona bir şeir ithaf etmişdir. Həmin şeirdən görünür ki, Fatma xanım Kəminə «Məclisi-fəramuşan»ın fəal üzvü olmuşdur. Onun yığıncaqlarında bilavasitə həm də fəal iştirak etmişdir.

Fatma xanım Kəminənin əldə olan əsərlərində mövzu-ideya etibarı ilə azad sevgi tərənnüm olunur. Ülvi məhəbbət onun yaradıcılığının qayəsini təşkil edir. Şairənin əsərlərindəki lirik qəhrəman dərd, qəm əlində giriftar olmuşdur. Gəncliyinin gözəl çağlarında sevimli ərini itirmiş incə qəlbli şairənin elə bil ki, ömür bağçasına acı səmum küləyi əsmişdir. Əri ölərkən Kəminənin 24-25 yaşı olardı. Bu ağır itki onun yaradıcılığına həzin bir kədər hissi gətirmişdir. Ərinin vəfatından iyirmi il keçməsinə baxmayaraq Kəminə 1883-cü ildə yazdığı şeirlərinin birində deyirdi:

İnsaf deyil binəsib üstə dil uzatmaq
Mən qalmamışam kimsənin xeyrü şərinə. (66)

Fatma xanım Kəminə 1898-ci ildə Şuşa şəhərində vəfat etmişdir.

«Məclisi-fəramuşan»ın üzvü və M.M.Nəvvabın yaxın dostlarından biri də Məşədi Nəsir Lövhinin kiçik qardaşı Məşədi Əyyub Sadıq oğlu Bakidir. Onun həyatı və ədəbi irsi barədə bizə ilk məlumatı M.M.Nəvvab vermişdir. Hətta Bakinin zahiri görünüşü, portreti barədə də Nəvvabın təsviri

müəyyən təsəvvür yaradır. Baki «…bədəncə zəif, pakizə əhval, xoş sifət, xoş danışan, zarafatcıl bir şəxsdir». (130, 379). O, bir neçə illik molaxana təhsilindən sonra Şuşanın tanınmış alimlərindən olan Mirzə Kərimdən xüsusi təhsil almış, Şərq ədəbiyyatı klassiklərinin yaradıcılığı ilə yaxından tanış olmuşdur. Baki hələ Mirzə Kərimin yanında oxuyarkən bədii yaradıcılığa dərin maraq göstərmiş, hətta ədəbi məsələlər ətrafında müəllimi Mirzə Kərimlə də mübahisəyə girmişdir.

Nəvvabdan sonra Baki haqqında məlumata Məhəmməd ağa Müctəhidzadənin «Riyazül-aşiqin» təzkirəsində rast gəlirik. Bakinin yaradıcılığına yüksək qiymət verən Müctəhidzadə yazır ki, onun təbi rəvanı uzun, ömrü isə boyu kimi qısa olmuşdur. Doğurdan da, Baki 43 il ömür sürmüşdür. 1909-cü ilin 5 avqustunda vəfat etmişdir.

Məşədi Əyyub Baki Nəvvabın xahişi ilə öz şeirlərini vaxtında bir yerə toplayaraq ona «Riyazül-məhəbbət» (Məhəbbət bağı) adı vermişdir. Daha doğrusu, Baki bu yolla öz divanını yaratmışdır. Təvazökar şair yazır: «Oxuyanlardan xahiş edirəm ki, bu şeir məclisinə açıq gözlə baxıb, onda buraxılan nöqsanları islaha çalışsınlar». M.Ə.Bakinin divanında şairin iki min beytə qədər Azərbaycan və fars dillərində yazılmış qəzəl, qəsidə, tərcibənd, rübai, bayatı və s. şeirləri toplanmışdır. M.M. Nəvvabın təzkirəsinə avtoqraf-xatirə yazanlardan biri də Məşədi Əyyub Baki olmuşdur. Baki Nəvvab «Təzkirə» sinə öz dəst-xətti ilə ana dilində iyirmi altı qəzəl, bir müxəmməs, bir təxmis; fars dilində isə on qəzəl və on rübaisini yazmışdır.

Mir Möhsün Nəvvabın Qarabağ ədəbi mühitinin Natəvan, Növrəs, Mirzə Rəhim Fəna, Məmai və bir çox

başqa nümayəndələri ilə də sıx yaradıcılıq əlaqəsi olmuşdur.

Nəticə etibarilə demək olar ki, «Məclisi-fəramuşan» üzvləri yaradıcılıqlarında həm Füzuli, həm də Vaqif ənənələrini müvazi olaraq davam etdirmişlər. Bunlardan bir qismi qəzəl klassiklərinə nəzirə yazanlar, bir qismi mücərrəd ilahi eşqi tərənnüm edənlər, digər qismi isə həyati sevgini, insani kədəri tərənnüm və təbliğ edən şairlər idi. Bu şairləri ümumi bir cəhət – xalq şeiri üslubunda yazmaq pafosu birləşdirirdi. Ümumiyyətlə, xalq şeiri üslubu XIX əsr Qarabağ ədəbi mühitinin əsas istiqamətini təşkil edirdi.

# II FƏSİL

# M.M.NƏVVABIN HƏYATI VƏ ƏDƏBİ-MƏDƏNİ FƏALİYYƏTİ

## 2.1. M.M.Nəvvabın həyatı və mühiti

Qarabağ ədəbi mühiti daha çox yaradıcı şəxsiyyətləri onların bədii düşüncə tərzi, əsərlərin üslub rəngarəngliyi və ənənəyə bağlılığı  ilə xarakterizə olunur. Əski mədəniyyət laylarını özündə qoruyub saxlayan bu mühit XVIII-XIX əsrdə klassik şeir üslubunu, təzkirəçilik ənənələrini inkişaf etdirməklə yanaşı yeni dəyər qazanır. Bu yenilik kökə, ilkinliyə, türk şeir ənənəsinə daha çox bağlılıqda özünü göstərir. Burada ilk növbədə heca vəznində yazıb-yaratma aparıcılıqla nəzərə çarpır. Daha doğrusu, çox qədim zamanlardan Şah İsmayıl Xətaiyə (147), Qurbaniyə (96) qədər davam edən şeir ruhu bu iki şəxsiyyətin simasında yeni mərhələsini yaşayırsa, XVIII-XIX əsr Qarabağ ədəbi mühitində özünün inkişafının ən böyük uğurları ilə səciyyələnir. Bütün bunlar isə ədəbi şəxsiyyətlərin yaradıcılıq qabiliyyətində, istedadında, bədii axtarışlarında üzə çıxır və təsdiq olunur.

Qarabağ ədəbi mühiti iki istiqamətdə araşdırmanı zəruri edir. Birincisi, məsələnin ümumi kontekstdə öyrənilməsi, problemin mahiyyətinin bütövlükdə açılması ön plana keçir. İkincisi, ayrı-ayrı məsələlər üzrə tədqiqat-ların aparılması daha da reallaşır. Burada konkret olaraq mühüm bir hissəni sənətkarların həyat və yaradıcılığının araşdırılması təşkil edir, yəni Molla Pənah Vaqifin, Kərbəlayi Səfi Valehin, Abdulla Canızadənin, Aşıq Səmədin, Aşıq Cəlalın, Şair Məhəmmədin, Aşıq Güllünün,

Qasım bəy Zakirin, Cəfərqulu xan Nəvanın, Ağabəyimin, Məhəmməd bəy Aşiqin, Aşıq Pərinin, Mirzə Həsənin, Xurşidbanu Natəvanın və başqalarının yaradıcılığının tədqiqi əsas yer tutur. Mir Möhsün Nəvvabın yaradıcılığı da həmin silsilədəndir.

Qarabağ ədəbi mühitindəki bütün problemlər kimi, Mir Möhsün Nəvvab yaradıcılığını da sinxron və diaxron istiqamətdə araşdırmaq zərurəti hələ də qalmaqdadır. Çünki M.M.Nəvvab Azərbaycan ədəbi-nəzəri fikrində çoxşaxəli yaradıcılığı ilə şöhrətlənib.

Düzdür, ayrı-ayrı şəxsiyyətlər, eləcə də problemlər bir sıra tədqiqatların mövzusuna çevrilib. Lakin onlar bu mühitin zənginliyi müqabilində çox azdır. Müsbət cəhət budur ki, böyük işin başlanğıcı qoyulub. Bu mənada Mir Möhsün Nəvvabın zəngin fəaliyyəti də eyni xarakterlidir. Onun fəaliyyətinin müxtəlif tərəfləri müəyyən dövrlərdə ədəbi-nəzəri fikrin marağında olub. Lakin təzkirəçilik fəaliyyəti həqiqi qiymətini almayıb.

Ədəbi-nəzəri fikirdə şair, ədəbiyyatşünas, musiqi nəzəriyyəçisi, pedaqoq, rəssam, xəttat, nasir kimi ad-san qazanan ədibin «Təzkireyi-Nəvvab» əsərində özü haqqında belə bir qeydi var: «Nəvvab Mir Möhsün Hacı Mir Əhməd oğlu ben, Mir Fərzənt ben, Mir Faseh ben, Mir Səbur, Şuşa şəhərində 1249-cu ildə anadan olmuşdur. Yeddi yaşında ikən ərəb, fars, türk elmlərini öyrənməyə başlamış və bütün elmlərdə məharətə çatmışdır» (130, 120). Buradan da Nəvvabın 1833-cü ildə Şuşada anadan olması aydınlaşır. Eyni zamanda nəsil şəcərəsi haqda təsəvvür yaranır. Məlum olur ki, atası Hacı Mir Əhməd, babası Mir Faseh, ulu babası isə Mir Səburdur. Nəvvabın atası və babası nəinki Şuşada, hətta bütün Qarabağda böyük nüfuza malik şəxsiyyətlər olmuşlar. Onun atası Hacı Mir Əhməd Şuşadakı ipək

karxanasında hesabdar işləmişdir. Atasından sonra Nəvvab həmin işi davam etdirmişdir.

Digər tərəfdən Nəvvab təzkirəçi, şair, rəssam, müsiqişünas kimi tanınmışdır. Xalq arasında böyük nüfuz qazanmasının səbəbi də məhz hərtərəfli istedadı, qabiliyyəti, hazırcavablığı və sadə adamlara daha çox yaxın olması idi. Odur ki, Qarabağın el ağsaqqalları, müdrikləri onu bu gün də xatırlayır və  haqqında müxtəlif maraqlı əhvalatlar, hadisələr söyləyirlər.

«Nəvvab» ərəb sözü olub lüğəti mənası «naib» deməkdir. Yəni Allahın elçisi, naibi anlamındadır. Lakin bu söz «canişin» sözü (XVII əsrdə əyalət canişini) kimi də izah olunur. Bu gün isə Nəvvab bizim üçün «ensiklopedik zəka sahibidir» (52).

O, ərəb və fars dillərini mükəmməl öyrəndikdən sonra Şuşanın ali mollası olan riyaziyyatçı və şair Molla Abbas Cavanşirdən hərtərəfli təlim almış və zəngin biliyə yiyələnmişdir. Bundan sonra özü də müəllim kimi Şuşada və bütün Qarabağda elmin, maarifin böyük təbliğatçısına çevrilmişdir. Uzun müddət Gövhər ağa məscidində açdığı yeni tipli məktəbdə dərs demişdir. Həmin məktəb «Gövhəriyyə» adı ilə məşhur olmuşdur. Burada dövrün elmlərindən ədəbiyyat, tarix, astranomiya və  fəlsəfəyə daha çox maraq göstərilirdi. Maraqlıdır ki, M.M. Nəvvab tədris prosesində özü hazırladığı dərsliklərdən istifadə etmişdir. «Kifayətül-ətfal» kitabı astranomiyaya aid dərslik kimi nəzərdə tutulurdusa, «Cəfri-camei-Murtəzəvi» coğrafi bilik vermə məqsədi daşıyırdı.

Nəvvab Şuşada kütləvi kitabxana və qiraətxana təşkilatçısı kimi də diqqəti cəlb edir. O, abunə və dostluq yolu ilə Şuşaya «Əkinçi», «Ziya», «Kəşkül», «Əxtər», «Həblülmətin» və başqa qəzetlər gətirmişdir. Bunları etməkdə

məqsədi insanların savadlanmasına qayğı göstərmək, ətrafda baş verənlərlə mühiti tanış etmək idi. Əhəmiyyətlidir ki, o, özü də həmin qəzetlərə məqalələr yazır, onlarla əməkdaşlıq edirdi.

Mir Möhsün Nəvvabın çoxşaxəli fəaliyyətinin mühüm bir hissəsini onun naşirliyi təşkil edir. Bu hadisə XIX əsrdə Qarabağ ədəbi mühitində çap məsələlərinin, naşirlik mədəniyyətinin bərqərar olmasını əks etdirir. Görkəmli ədibin bu işi, eyni zamanda Azərbaycanda nəşriyyat tarixini öyrənmək üçün əsaslı faktdır.

Məlum olduğu kimi, o, XIX əsrin 80-ci illərində Şuşada mətbəə açmış və həmin mətbəədə 50-yə qədər kitabın nəşrinə nail olmuşdur. Hətta öz əsərlərindən bir neçəsini də burada çap etdirmişdir. Nəvvab «Divani-əşari-farsı» adlı (bu əlyazma-avtoqrafı Respublika Əlyazmaları fondunda mühafizə olunur) əsərinin daşbasma çapında maraqlı bir məqamı qeyd edir. O yazır ki, mətbəənin imkanı məhdud olduğu, yazını daşa köçürən «xoşnəvis» katibin olmaması üzündən «Divani-əşari-fars» cəmi 64 səhifədən ibarət oldu. Çap kitabını yaxşı xəttata yazdıran Nəvvab kitabların nəfis bədii tərtibatını özü yerinə yetirmişdir. Bu isə onun istedadının tamamilə başqa tərəfini aşkarlayır.

«Təzkireyi-Nəvvab»da Mir Mehdi Xəzani haqqında verdiyi məlumatda bildirir: «…Ibtidai məktəb uşaqları üçün bir risalə tərtib edib nəzmə çəkmişdir. O risalənin adı «Şərait-ül-islami»dir. 1302-ci ildə risalə mənim çapxanamda iki yüz tirajla nəşr edilmişdi» (130, 202). Bu artıq onun nəşriyyat işi ilə ardıcıl məşğul olduğunu göstərir. Eyni zamanda XIX əsrdə Qarabağ ədəbi mühitinin zənginliyini və rəngarəngliyini özündə ehtiva edir. «Qarabağnamələr» kitabında verilən qeyd də bunu bir daha təsdiqləyir: «Əhməd bəyin bütün əsərlərindən bizim üçün ən mühüm

olanı 1883-cü ildə Şuşada yazılmış «1747-ci ildən 1805-ci ilə qədər Qarabağ xanlığının siyasi vəziyyətinə dair» adlı əsəridir. Bu əsər ilk dəfə 1884-cü ildə Tiflisdə, sonra isə 1901-ci ildə Şuşada nəşr olunmuşdur» (86,155). Belə qənaətə gəlmək olar ki, həmin kitab Nəvvabın mətbəəsində çap edilmişdir.

Mir Möhsün Nəvvab Azərbaycanda təsviri sənət və kitab tərtibatının inkişafında böyük rol oynamışdır. Onun «Bəhrül-həzən» əsərinə çəkdiyi illüstrasiyalar sözün həqiqi mənasında tarixi hadisə səviyyəsindədir. Burada böyük tarix, insanların mübarizə əzmi, qəhrəmanlıq səhnələri vəhdətdə, qovuşuq halda verilmişdir. Bu, bir növ Mir Möhsün Nəvvabın düşüncəsinin zənginliyi faktına çevrilir. Əgər «Bəhrül-həzən»dəki illüstrasiyalar (5 şəkil) qəhrəmanlığa, tarixiliyə xidmət göstərirsə, «Kənzül-mühən»dəki illüstrasiya təbiət mənzərəsini əks etdirir. Onun Şuşada məscidin minarələrində, öz evinin və dərs dediyi məktəbdə divar rəsmləri, quş və çiçək təsvirləri incə zövqlü bir insanın sənət incilərini xatırladır. Nəvvabın R.Mustafayev adına Azərbaycan Dövlət Incəsənət Muzeyində «Güllər», «Quşlar», «Əmir Teeymur» və başqa portretləri nümayiş etdirilir. Nəvvab «Bəhrül-həzən» («Qəm dəryası») 1864, Azərbaycan EA Respublika Əlyazmaları fondu) adlı əlyazmasına fantastik süjetli illüstrasiyalar çəkmişdir. Bütün bunlar onun zəngin istedadının, qabiliyyətinin bir hissəsi kimi xarakterizə olunur. Onlar bir tərəfdən müəllifin fərdi qabiliyyəti kimi görünürsə, digər tərəfdən Qarabağ ədəbi mühitində, ümumilikdə Azərbaycanda təsviri sənətin inkişaf tarixini izləmək üçün material verir və bu istiqamətdə araşdırmalar aparmağı zəruri edir. «Azərbaycanda ilk dəfə kağız üzərində bədii kəsmələri

tətbiq edən Nəvvab gül-çiçək, quşlar və bədii fiqurlardan istifadə etmişdir» (67, 31).

«Kəşfül-həqiqeyi-məsnəvi» (üç cildlik) adlı əsəri isə mənzumələrin məzmununa uyğun çəkilmiş rəsmlərlə diqqəti cəlb edir. Bundan əlavə «Bəhrül-həzən» və «Kənzül-mühən» əsərindəki şəkillər dini-tarixi hadisələrin əksi xarakteri daşıyır.

Nəvvabın həyat və fəaliyyətinin başqa bir tərəfi isə Qarabağ mühiti üçün son dərəcə səciyyəvi olan ədəbi və musiqi məclislərinin təşkili ilə bağlıdır. O, 1872-ci ildə «Məclisi-fəramuşan» adlı ədəbi məclis (137) yaratmış və bu işin hər bir ağırlığını öz üzərinə götürmüşdür. Hətta evini məclis iştirakçılarının ixtiyarına vermişdir.

O, 1880-ci illərdə məşhur xanəndə Hacı Hüsü ilə birlikdə Şuşada «Musiqiçilər» məclisi yaratmışdır. Həmin məclis Azərbaycan musiqi sənətinin inkişafında müstəsna rol oynamışdır. Nəvvab yeni istiqamətdə ardıcıl işlər apararaq, Şuşanın musiqi mərkəzinə çevrilməsinə xüsusi qayğı göstərirdi. Böyük xanəndə Hacı Hüsünün iştirakı ilə «Xanəndələr məclisi»ni də yaratmışdır ki, bu musiqi məclisi Xarrat Qulunun musiqi məclisindən və Xurşidbanu Natəvanın «Məclisi-üns»ündən sonra şəhə-rin mədəni həyatında müstəsna rol oynamışdır (148, 240).

Mir Möhsün Nəvvab təkcə musiqiçilər məclisi yaratmaqla kifayətlənmirdi, həm də başqa istiqamətdə araşdırmalar aparır, onun nəzəri problemlərini çözməyə çalışırdı. O, bu çalışmalarında Şərq musiqi tədqiqatçılarının, orta əsrlər Azərbaycan alimlərinin əsərlərinə istinad edirdi. Muğamlarla bağlı yazılan «Vüzuhul-ərqam» əsəri Nəvvab təcrübəsinin nəticəsi kimi ortaya çıxmışdı. Orada verilən cədvəl mükəmməlliyi ilə diqqəti cəlb edir. Eyni zamanda klassik musiqi tariximizi öyrənməyə şərait yaradır.

Bütün bunları yaxşı bilən S.Vurğun vaxtilə yazırdı: «Şuşanı əbəs yerə musiqi və poeziyanın beşiyi adlandırmırlar. Demək olar Azərbaycanın bütün məşhur oxuyan və çalğıçıları Şuşada doğulmuşlar» («Pravda» qəz., 23 may 1940).

Cəfərqulu xan Nəvadan, Xarrat Quludan, Kor Xəlifədən keçib gələn musiqi yolu Mir Möhsün Nəvvab düşüncəsində, fəaliyyətində zənginləşirdi. O dövrdə bu zənginliyin nəticəsi olaraq xalq arasında «Şuşanın uşaqları ağlayanda «Segah», güləndə «Şahnaz» üstə gülərlər» məsəli dolaşmaqdaydı. Belə bir düşüncənin formalaşmAsında isə müstəsna xidmətləri olanlardan biri məhz Mir Möhsün Nəvvab idi. M.M.Nəvvabın yaşadığı zaman kəsiyində bir çox ədəbi-mədəni hadisələr meydana çıxmışdır; maarifçilik ideyalarının geniş yayılması, yeni tipli məktəblərin açılması, milli mətbuatın yaranması, ədəbi məclislərin geniş fəaliyyət göstərməsi, ilk kütləvi kitabxananın yaradılması, qəzet nəşrlərinin çoxalması və s. Bütün bunlar M.M.Nəvvabın həyat və fəaliyyətinə öz təsirini göstərmiş, onun dünyagörüşünün formalaşmasında, yaradıcılıq meyllərinin dərinləşməsində əsas amil olmuşdur. Odur ki, M.M.Nəvvab Azərbaycan, fars və ərəb dillərində 40-a yaxın elmi və ədəbi-bədii əsər yazmaqla xalqımıza xidmət etmiş, vətəndaşlıq borcunu layiqincə yerinə yetirmişdir.

1. «Cəfri-came», 2.«Bəhrül-həzən», 3.«Kənzül-mühən», 4.«Risaleyi-Batülüs-sehr», 5.«Vüzuhül-ərqam», 6.«Şəmsül-hidayə», 7«Şərhi-üstürlab», 8.«500 nəsihət». («Nəsihətnamə»), 9.«Nurül-ənvar», 10.«Təzkirə», 11.«Farsca şeirlər divanı», 12.«Türkcə şeirlər divanı», 13.«Məzamir», 14.«Kəşfül-həqiqə», (3 cilddə), 15.«Məcaibül-əxyar», 16.«Muxtarnamə». 17.«Məzlumnamə».18.«Ziyaül-ənvar», 19.«Erməni-müsəlman münaqi-

şəsi», 20.Müseyibnamə» (129,9), 21.«Kifayətül-ətfal», 22.«Nur-ül-ənvar» risaləsi, 23.«Həqiqinin farsca və onun türkcə şeir kitabları», 24.«Asarül-əimmə», (130, 236-238), 25.«İstixrac», 26.«Nücum» (129, 9). 27.“Rəddi-bab” (9,53), 28.“Avropa ibtidai musiqi savadı”, 29.“Dəvaz dəh bənd”, 30.“Kitabi-əhkam, əşqal əl rəml” (“Rəml formalarının ehkamlarına dair kitab”) Azərbaycanca, 31.“Məcmuə” (Nəvvabın dini, elmi, ədəbi, tibbi və s. qeydləri), 32.“Məcmuə” (Farsca), (1. Falnamə, 2. Şeyx Bəhai “Nan və halva”, 3. Elmi-musiqi risaləsi), 33.“Məcmuə” (Müxtəlif şairlərin şeirləri) Nəvvab, Müniri, Vaqif., 34.“Seçilmiş şeirlər və onlara digər şairlərin cavabları”, 35.“Tarixə aid əlyazma” (59, 22-24), 36.“Şükürnameyi-şahənşahi” (Bəhmən Mirzənin də bu adda əsəri vardır.), 37.“Asarül-eyliqə”, 38.“Məsibnamə” (54, 10-11)

Ədəbi-nəzəri fikirdə M.M.Nəvvabın əsərlərinin iyirmidən çox olduğu qeyd olunurdu. Lakin onların adı heç bir dəqiqliklə göstərilmirdi. Biz bunları araşdırmalar nəticəsində dəqiqləşdirməyə çalışdıq və belə bir ardıcıllıqla yazılması qənaətinə gəldik. Bu əsərlərin hər biri problemin qoyuluşu, aktuallığı ilə diqqəti cəlb edir. Müəllifin dünyagörüşü, zəkası, düşüncələri haqqında tam təsəvvür yaradır. Eyni zamanda mühitdə gedən prosesləri izləməyə imkan verir. Həmin əsərlər bu gün belə böyük dəyər kəsb edir və o dövrün ədəbi mənzərəsini təhlil edib araşdırmaq zərurəti yaradır. Bu əsərlər həm məzmun, həm dil xüsusiyyətləri ilə seçilir. Məsələn, «Bəhrül-həzən» və «Kənzül-mühən» əsərləri 1864-cü ildə fars dilində yazılmışdır (79). Çox ehtimal ki, bu əsərlər Nəvvabın ilk qələm təcrübələrindəndir. Hər iki əsərdə Kərbala müsibətləri təsvir edilir. Ola bilsin ki, «Müqəddəslərin müsibəti», «İkinci imamın imamlığı aşurası imamlıq etdiyi

müddət və onun şəhid olması, dəfni» və s. əsərlər də Nəvvab yaradıcılığının birinci dövrünə aiddir. «Məzamir» əsəri də dini-fantastik məzmunda olub 12 məqalədən ibarətdir. Əsər 1883-cü ildə fars dilində yazılmışdır. Bunlar M.Möhsün Nəvvabın yaradıcılığının digər bir istiqamətini, dini məzmunlu əsərlər yazmasını aşkarlayır. Eyni zamanda dini inam və etiqadların, rəvayət və hadisələrin özünəməxsus şəkildə Qarabağ ədəbi mühitində yaşandığı sübut olunur. Digər tərəfdən ədibin fars dilində yazıb-yaratma ənənəsinə sadiq qaldığı tam aydınlıqla görünür. Bunu «Vüzuhül-ərqam» əsəri də təsdiq edir.

«Vüzuhül-ərqam» («Musiqi elmində rəqəmlərin aydınlaşdırılması») (132) əsəri 1883-cü ildə fars dilində yazılmışdır. Əsər Azərbaycanda musiqişünaslıq elminə dair nəşr olunmuş ilk kitabdır. Burada M.M.Nəvvab istedadının tamamilə başqa tərəfi, onun ədəbiyyatşünas olmaqdan əlavə musiqişünas kimi də böyük işlər görməsi mühüm dəyər kəsb edir. Müəllifin musiqi sənəti ilə bağlı irəli sürdüyü nəzəri mübahisələr onun klassik musiqiyə dərindən bələdliyini göstərir. Eyni zamanda XIX əsr ədəbi mühitində poeziya ilə musiqinin bahəm inkişaf etdiyini aydınlaşdırır. 1913-cü ildə Bakıda Orucovlar mətbəəsində çap olunan bu əsər Nəvvabın Hacı Hüsü ilə birlikdə təşkil etdiyi «Musiqiçilər» məclisinin nəzəri əsası kimi yazılmışdır. Onu da qeyd edək ki, ədibin musiqiyə olan marağı təkcə bu əsərlə məhdudlaşmır. Eyni zamanda bu gün xalq arasında yaşlı nəslin yaddaşında qorunan müxtəlif söhbətlər və hekayələr onun musiqi ilə bağlı düşüncəsinin aydınlaşmasına yardımçı olur. Həmin söhbətlərdən aydınlaşır ki, Nəvvab musiqiyə qulaq asmağı, muğamatı dinləməyi çox sevərmiş. O, deyərmiş: «Insanın musiqidən aldığı həzzi başqa heç bir şeylə əvəz etmək olmaz. Gör nə

günə qalmışıq ki, bu avam mollalar bizi dünyanın ən gözəl hissindən məhrum etməyə çalışırlar. Musiqidən nəinki insanlar, hətta heyvanlar və quşlar da təsirat alırlar. Lazım olduqda musiqi ilə müalicə də edirlər. Mənim xəstə könlümü ilhamlandıran, məni yaşadan deyərdim ki, musiqidir» (27,56). Bu, Nəvvabın musiqiyə verdiyi qiymətdir və musiqinin insan düşüncəsində yeniliklər yaratmaq qüdrətini ifadə edir. Təkcə onu xatırlatmaq lazımdır ki, şaman dualarında musiqi müalicənin yarısına bərabər tutulurdu. Onların dualarının bu işdə müstəsna əhəmiyyəti vardı. M.M.Nəvvab da məhz həmin reallıqlardan çıxış edərək bu qənaətə gəlirdi.

Nəvvab təzkirəsində də musiqi haqqında çoxlu fikir söyləmiş, onun ecazkar bir qüvvəyə malik olduğunu göstərmişdir. Bu deyimləri ilə o, klassiklərimizi, N.Gəncəvini (57), M.Əvhədini, M.Şəbustərini, Ş.I.Xətaini (147), M.Füzulini (56) xatırladır. Onlar da müxtəlif məqamlarda musiqi ilə bağlı maraqlı fikirlər söyləmişlər. Nizami Gəncəvinin «Xosrov və Şirin», «Isgəndərnamə» poemalarında (57) olan deyimlər buna nümunədir. Hətta burada böyük şair musiqinin mənşəyi, bu alətlərin hazırlanması məsələsinə də toxunur. Bir sıra əfsanə və rəvayətlər verir. Bu xüsusiyyətlər, məhz, XIX əsrdə Mir Möhsün Nəvvabın yaradıcılığında da bu və ya digər şəkildə təkrarlanırdı. Nəvvab "Vüzuh-ül-ərqam" əsərində hər bir muğamın özünəməxsus xüsusiyyətlərindən söz açaraq, cədvəl üzrə dörd səvt, yeddi pərdə, on iki muğam, iyirmi dörd şöbə və on beş avaz olduğunu qeyd edir. Bu faktlar və təhlilləri eyni zamanda o dövrdə musiqinin inkişafı üçün də sübut və dəlil kimi qəbul etmək olar. Məhz həmin mərhələdə yaranan musiqi məktəbləri müstəsna rol oynayırdı. XIX əsrin ikinci yarısında təşkil olunmuş ədəbi-musiqi məclisləri, məşhur musiqişünas Xarrat Qulunun, Kor

Xəlifənin musiqi məktəbləri məhz bu qəbildəndir. «XIX əsrin axırında Qafqazın, Orta Asiyanın, Yaxın Şərqin hər yerindən buraya olan güclü axın da bu mühitin qaynarlığını göstərir. Bu ənənənin kökü isə xeyli qədimlərə gedir və XVIII-XIX əsrlərdə də davamlı olaraq yaşanır. Ibrahim xanın, Cəfərqulu xan Nəvanın təşkil etdiyi məclislər buna nümunədi. F.Köçərli bu məqamı qeyd edərək yazır: «Cəfərqulu xan babası kimi dilir, pəşid, qəviheykəl və pürhünər bir zat imiş. Əhli-zövqü şövq olduğu üçün vaxtını işrətdə keçirərmiş, tar-tənburu, çəng-çəğanı, mütrib və müğənnini dost tutarmış» (75, 350). Bütün bunlar M.M.Nəvvaba əvvəlki mərhələdən gələn yoldu.

«Vüzuh-ül-ərqam» özlüyündə nəzəri düşüncənin bariz nümunəsidir. Belə ki, əsərdə bir sıra dəstgahların hissələri də göstərilmiş, ayrı-ayrı şəxslər tərəfindən muğamlara verilən adların yaranması izah edilmişdir.

«Şəmsül-hidayə» əsərini Nəvvab 1887-ci ildə fars dilində yazmışdır. Əsərdə XVI əsrdə Avropada xristian dininin parçalanması nəticəsində əmələ gələn protestantlıqdan və Lüterdən danışılır. Bu isə onun dünyada baş verən proseslərə, tarixi hadisələrə bələdliyini və həmin hadisələrə fəal münasibətini aşkarlayır.

«Kəşfül-həqiqə» əsəri 1894-1895-ci illərdə fars dilində yazılıb. Əsər üç cilddən ibarətdir. Əsərdə Nəvvabın nəsihətamiz şeirləri, mənzum hekayələri, qəzəl və qəsidələri də yer almışdır. Əsər M.M.Nəvvabın Azərbaycan ədəbiyyatında, Qarabağ ədəbi mühitində yerini aşkarlamaq üçün kifayət qədər material verir. Məlum olduğu kimi, o təkcə musiqişünas, astronom, xəttat, təzkirəçi, «Məclisi-fəramuşan»ın rəhbəri kimi diqqəti cəlb etmir, eyni zamanda fəalliyyətinin mühüm bir hissəsini bədii yaradıcılığı təşkil edir. Belə ki, müasirləri kimi M.M. Nəvvab da klassik

üslubda, bəzən heca vəznində gözəl bədii nümunələr, qəzəl, qəsidə, mənzum hekayələr yazmışdır. Bu nümunələrin bir qismi fars dilində yazılmışdır. Onu da qeyd edək ki, «Kəşfül-həqiqə» əsərində verilən nümunələrin hamısı fars dilindədir. Daha doğrusu, burada müəllifin fars dilində yazdığı nümunələr toplanmışdır. Həmin nümunələr M.M.Nəvvabın bir şair kimi yaradıcılıq imkanlarını, poeziyada yerini göstərməyə əsas verir.

Üç hissədən ibarət olan bu kitabda müəllif riyaziyyat, kimya, astranomiya elmlərinin faydalı olmasından və musiqinin əhəmiyyətindən bəhs edir. Qumarbazlıq, sərxoşluq və şəhvət düşgünləri tənqid olunur. Ədib bu düşüncələrini oxuculara müxtəlif formalarda çatdırmaq, eyni zamanda əsərlərinin bədii təsir gücünü artırmaq məqsədilə tipik olan xalq əfsanə və rəvayətlərindən yerli-yerində istifadə edir. Dövrün ictimai-siyasi haqsızlıqlarına özünün münasibətini bildirir. İnsanlardakı mənfilikləri, sərxoşluq hallarını, iftira və riyanı qamçılayır. Bunlardan «Qoyunun qurda tapşırılması», «Hiyləgər tülkü», «Qan içən, lakin doğru danışan canavarın hekayəti» və s. daha çox diqqəti cəlb edir və özlüyündə klassik ənənəyə bağlanır.

Onu da qeyd edək ki, «Kəşfül-həqiqeyi» məsnəvisi Nizaminin «Sirlər xəzinəsi» ənənələrini davam etdirən bir əsərdir. Bu məsnəvi klassik ənənədə «Kəlilə və Dimnə»yə, S.Qəznəvinin «Hədüqətül-həqayiq», Sədi Şirazinin «Büstan», «Gülüstan», Ə.Caminin «Baharistan» əsərinə yaxınlaşır. Tipik hadisələr, xarakterik əhvalatlar şairin dünyagörüşünün zənginliyini əks etdirir. Nəvvab bu əsərlərdə öz humanizmini nümayiş etdirmiş, təhsili, elmə yiyələnməyi hər şeydən uca tutmuşdur. Eyni zamanda, insanları hiyləgərlik, tənbəllik, riyakarlıq, xəsislik, cəhalətpərəstlik kimi çirkin əməllərdən uzaqlaşdırmağa

çalışmışdır. Onu da qeyd edək ki, Nəvvab didaktik məzmunlu nəsihətlərlə dolu olan bu əsərlərini 1901-ci ildə özü çap etmişdir.

Nəvvab ədəbi prosesdə, eləcə də ictimai-siyasi həyatda baş verənlərə həmişə fəal münasibət bildirmişdir. Aktuallıq kəsb edən məsələlərdən biri də əlifba məsələsi idi. XIX əsrin ikinci rübündən bu bir ardıcıllıqla ədəbi prosesdə, ictimai mühitdə özünə yer almışdı. M.F.Axundovun məqalələri buna nümunədi. M.M.Nəvvab da həmin prosesin içərisinə daxil olmuşdur. «Batilüs-sehr» əsərini Nəvvab 1893-cü ildə fars dilində yazmışdır. Əsərdə Mirzə Rza Rüşdü Naib Məqamın tərtib etdiyi yeni əlifbası ilə Nəvvab razılaşmadığını bildirir. Belə ki, Mirzə Rüşdü Naib Məqam «Ziyayi-Qafqaziyyə» qəzetində yeni əlifba məsələsinə dair məqalə dərc etdirir. Nəvvab bu əsərində onun çatışmamazlıqlarını, geniş şərhini verir. Həmçinin Nəvvab M.F.Axundovun əleyhinə çıxaraq ərəb əlifbasının əhəmiyyətindən danışır.

«Divani-farsi» əsərində müəllifin əlliyə qədər qəzəli, on beş qəsidəsi və bir neçə rübaisi verilir. Bu divan müəllifin bir şair kimi istedadını, bədii yaradıcılıq imkanlarını aşkarlayır. Eyni zamanda divan tərtib etmə (yaratma) ənənəsində klassiklərə bağlandığını göstərir. Oradakı qəzəl, qəsidə, rübailər özünün rəngarəngliyi, müəllifin poetik dünyagörüşünü əks etdirə bilmək baxımından əhəmiyyətlidir. Bu divan 1898-ci ildə tərtib edilmişdir.

«Kifayətül-ətfal» əsəri isə nücum elmindən bəhs edir. Əsər 1899-cu ildə ərəb və Azərbaycan dillərində yazılmışdır. Əsərdə günəş sistemi, onun quruluşu və hərəkəti haqqında məlumat verilir. Nəvvab günəşin və ayın tutulmasını müasir elmin tələbləri səviyyəsində izah etmişdir. Əsərdə yerin kürə şəklində olması və ekvator xəttindən də bəhs edilir. Nəvvab yerin beş qitədən ibarət olmasını və

cənub qütbündə həyatın olmamasını da göstərir. Bu əsəri yazarkən o, həyati təcrübələrini də qələmə almışdır. Nəql edirlər ki, Nəvvab payız gecələrində Cıdır düzü yaxınlığındakı mağaradan özü hazırladığı cihazla (üstürlabla) səmanı müşahidə edərmiş. Hal-hazırda həmin mağara «Nəvvab» mağarası adlanır.

«Nurül-ənvar» əsəri isə ayrı-ayrı nəsihətlərdən ibarətdir. Bu nəsihətlər onun hansı hisslərlə yaşadığını, daxili aləmini, necə bir düşüncəyə malik olduğunu aydınlıqla göstərir. Ümumiyyətlə, nəsihətçilik ruhu M.M. Nəvvabın yaradıcılığının əsas istiqamətlərindən birini təşkil edir və bütün fəaliyyəti boyu aydınlıqla nəzərə çarpır. Istər lirik şeirlər divanında, istərsə də mənzum hekayələrində belə bir əhvali-ruhiyyə onun əsərlərinin qayəsinə çevrilir. «Nurül-ənvar» əsəri də bu sıradadı. Əsər 1899-cu ildə fars dilində yazılıb, iyirmi dörd məqalə və xatimədən ibarətdir.

M.M.Nəvvabın digər əsəri «Ziyaül-ənvar» əsəridir. O, 1900-cu ildə fars dilində yazılmışdır. Əsərdə islam dininin yaranması haqqında kifayət qədər ətraflı məlumat verilir. Bu, onun mükəmməl dini təhsil aldığını, ilahiyyatla bağlı ədəbiyyatlara bələdliyini göstərir. Həmin əhvali-ruhiyyə qəsidə, mürəbbe, rubai və digər şeirlərində də davamlı olaraq yaşanır.

Qeyd etdiyimiz kimi, M.M.Nəvvab yaradıcılığının mühüm bir hissəsini nəsihətləri, nəsihətamiz mövzuda yazdığı əsərləri təşkil edir. Onlardan biri də «Nəsihətnamə»dir. Bu əsəri Nəvvab 1906-cı ildə fars dilində yazmışdır. Beş yüz nəsihətdən ibarət olan bu əsər 1912-ci ildə Bakıda ədibin oğlu Mir İbrahim Ağamirzadənin naşirliyi ilə «Orucov qardaşlarının elektrik mətbəəsi»ndə çap olunmuşdur. Həmin əsər 1987-ci ildə Mehri Məmmədovanın nəfis tərtibi ilə yenidən çap edilmişdir. 2005-ci

ildə «Araz» nəşriyyatı yenidən «Nəsihətnamə» əsərini çap etmişdir. Əxlaqi-tərbiyəvi mövzuda olan «Nəsihətnamə»də (127) Nəvvabın amalı, xeyirxah ideyaları, həyata baxışı, məqsəd və məramı aydın şəkildə əksini tapır. Burada yalan, riya pislənir. O, kitabında maraqlı olaraq vurğulayır: «Yalan söz deməyə adət etmə, günahlar yalandan başlanır». Bu bir növ müqəddəs, səmavi kitablardan gələn xüsusiyyət kimi M.M.Nəvvabda davam edir. O, xüsusi olaraq oxucuları həmin nəsihətlərə əməl etməyə çağırır. Eyni zamanda deyir ki, «özgəsinə nəsihət edirsənsə, əvvəlcə özün ona əməl et». Bu, M.M.Nəvvabın həyat amalının əks-sədasıdır. Nəvvab yenə birmənalı olaraq vurğulayır: «O alimlər ki, beşgünlük dünyanın keyfindən ötəri haqq, qanun əleyhinə çıxırlar, onların mənasız, boş sözlərinə qulaq asma, sonra peşmançılıq çəkərsən». Bu isə müəllifin həyat təcrübəsinin, zəngin müşahidələrinin nəticəsi olduğu üçün bütün zamanlar üçün yeni səslənir.

Dövrünün təbabət elmini yaxşı bilən Nəvvab «Nəsihətnamə»də (127) sanitariya qaydalarına riayət etməyi, təmiz yuyunmağı məsləhət görür, eyni zamanda papiros, tiryək və şərabın zərərli cəhətlərini pisləyir. O, məsləhət görür ki, insan ağır xörəyi çox yeməməli, günortadan sonra yatmamalı, gecə yuxudan oyanıb su içməməli, tox halda hamama getməməli, həddindən artıq cinsi əlaqədə olmamalı, iki hava arasında oturmamalı və zökəm olan zaman şirin və çox yağlı yeməkdən çəkinməlidir. «Özün bəyənmədiyin bir işi özgələrinə rəva bilmə» - deyən Nəvvab sözün həqiqi mənasında iç aləmini ifadə edir. Insanları bununla yaxşılığa, müsbət keyfiyyətlərə sahib olmağa səsləyir. Mədəniyyəti, insanlığı, xeyirxahlığı, səxavəti, yaxşı dost tutmağı, vəfadarlığı, əhd-peymana əməl etməyi təbliğ edir.

İnsanları kinli olmamağa, edilən yaxşılığı unutmamağa, xoş təbiətli, kəramətli, səxavətli, qənaətcil yaşamağa, həqiqətə inanmağa, tərbiyə verənin qədrini bilməyə, yaxşı adamlarla dost olmağa, etik normalara, gigiyenik qaydalara əməl etməyə səsləyir.

Milli forma, milli zəmin, soy kökünə bağlılıq Nəvvab əqidəsinin idealıdır. Odur ki, «Nəsihətnamə»də də bütün yaradıcılığında olduğu kimi öz amalına sadiq qalmış, həmişə böyük ideallarına sədaqət göstərmişdır. Bu əsər kifayət qədər əhatəlidir. Ictimai həyatın bütün tərəfləri burada özünün əksini tapır. Ailə münasibətləri də bu sıradadır. O, xüsusi olaraq vurğulayır: «Nigah bağladığın vaxt hər iki tərəfin razılığını öyrən ki, qadın özgəsinin kəbinində və yaxud iddəli olmasın. Talaq oxumaq istəyirsənsə, bir neçə gün səbr et, bəlkə ər və yaxud arvad peşman ola və barışalar. Arvad boşamanı xoşagəlməz bir hal hesab et, belə işin sahibini sevməzlər» – deyir. Bununla o yalnız ayrı-ayrı şəxsləri tərbiyələndirmək məqsədi güdməmiş, dövrünün araqarışdıran, rüşvətxor, şər toxumu səpən və mənfəətlərini güdən bir ovuc nankorları insanlığa çağırmışdır. Məhz bu baxımdan Nəvvabın nəsihətlərinə bütöv bir kompleks kimi baxmaq gərəyi yaranır. O, kamilləşmiş insanları cəmiyyətə namusla xidmət etməyə çağırır. Nəvvab xüsusi olaraq vurğulayır: «vəzifəli şəxssənsə, özündən əvvəl əlinin altında işləyənlərin rahatlığına çalış, insafsız, zülmkar və rüşvətxorları qulluqdan uzaq et, xoşxasiyyət, doğru danışan və çalışan adamları əziz və möhtərəm tutub, onların rütbəsini artır, sözgəzdirən və fitnəkar şəxslərlə həmsöhbət olub, onlara etibar etmə, başından et, qoy getsinlər, heç bir kəsin günahını aydınlaşdırmamış, tənbeh etmə» (127, 33). Bütün bu fikirlərin yekunu olaraq M.M.Nəvvab deyir: «Dövlət ittifaq və həmfikir olmaqdan əmələ gələr» (123, 35). Bu döğurdan da belədir və

XIX əsrin düşüncəsini əks etdirsə də, bu günümüz üçün də aktualdır.

Bütün bunlar Mir Möhsün Nəvvabın çoxşaxəli yaradıcılığının müxtəlif tərəflərinin görüntüləridir. Bu zənginlikdə maraqlı olacaq istiqamətlərdən birini onun şair kimi yaradıcılığı təşkil edir. XIX əsr ədəbi mühitində o bir şair olaraq poeziyanın zənginləşməsində mühüm rol oynamışdır. Ərəb, fars dillərini mükəmməl bilən M.M. Nəvvab üç dildə də qələmini sınamışdır. Yaradıcılığının böyük bir hissəsi fars dilində olmuşdur. Bu onun nəsihətlərində, dinə, astronomiyaya, musiqiyə aid yazdığı əsərlərində, farsca divanında aydınlıqla görünür və onun geniş, zəka sahibi olmasını bir daha təsdiqləyir. Nəvvabın bədii yaradıcılığını aşiqanə qəzəllər, müxəmməs, mürəbbe, rübai, təxmis, məsnəvi və təmsillər təşkil edir ki, bu da mövzuların rəngarəngliyi, problemlərin qoyuluşu baxımından mühüm dəyər kəsb edir. Onların bir hissəsi dini səciyyə daşıyırsa, digər bir qismi dövrün, zamanın doğurduğu problemlərə etiraz kimi səslənir.

Sufilər musiqi, nəğmə və rəqsin insanın mənəvi kamilliyinə nail olmaq üçün mühüm vasitə olduğunu nəzərə alaraq onun elementlərindən istifadə etmişlər. Orta çağ təriqətlərində istifadə olunan musiqinin mistik dinlənilməsi (əs-səma) sufi dindardan ayinin bütün tələblərini diqqətlə yerinə yetirmək tələb edirdi. Bu da eşitmə aparatının qeyri-adi psixi-emosional vəcd yaradan məşğələlər əsasında mümkündür. Odur ki, sufi dindar olan M.M.Nəvvabın «Elmi, dini, tibbi qeydlər» əsərində «Ruhlarla danışma üsulu» heç də əfsanə deyildir. M.M. Nəvvabın bütün varlığı ilə musiqiyə bağlılığını sübut edən dəlillər kifayət qədərdir. Mirzə Xosrov Axundovun şahidi olduğu bir xatirə (9) daha böyük dəyər kəsb edir və ədibin musiqi dünyasının zəngin-

liyindən xəbər verir: «Mir Möhsün Nəvvab məşhur xanəndələr və gözəl sövtü olan adamlarla yaxından əlaqə saxlayardı. Hətta öz mənzilinə onlardan bəzilərini dəvət edib oxudardı. Baharda və yayda Nəvvab tərəfindən təşkil olunmuş «Ağzı yastı kaha»da Molla Vəli, Mirzə Əli, Molla Abbasqulu, Cabbar Qaryağdı oğlu, Məşədi Dadaş, Məhəmməd Həsən bəy kimi gözəl səsli və musiqi ustalarını bir yerə cəm edib onların sövtilərindən bədii zövq alardı. Şəxsən mən özüm belə yığıncağın dəfələrlə şahidi olmuşam.

Süfrə salınmış, kabab hazırlanmış, çay dəmdə, başda Mir Möhsün Nəvvab olmaqla bu adamlar süfrə ətrafında əyləşib istirahətlə məşğul olurdular. Yeyib-içdikdən sonra musiqi səslənirdi. Müəyyən bir dəsgahı başlayaraq növbə ilə oxuyardılar.

Musiqi bitdikdən sonra iradları söyləyərdilər. Təbiətin ağuşunda musiqi oxunarkən kahanın ətrafında xeyli bülbüllərin uçub gəlməsini gözümlə görmüşəm.

Bir zaman mollalar Nəvvabın musiqiyə həvəs göstərməsinin əleyhinə qalxmışdılar. Şərq musiqisi ilə maraqlanan Nəvvab öz fikrində möhkəm dayanaraq musiqinin bir elm olduğunu sübut etmək üçün musiqiyə dair bir kitab da yazmışdır. Kitabın nəşrindən əvvəl Nəvvab Fazil Iravani adlı müctəhidə məktub yazaraq, onun fikrini bilmək istəmişdir. Cavabda belə yazılmışdır: «Ağa müctəhid, elmi nöqteyi – nəzər ilə musiqiyə qulaq asmaq və yaxud musiqiyə kitab yazmaq caizdir». Bu cavabı alandan sonra Nəvvab musiqi elminin inkişafına dair «Vüzühül-ərqam» kitabçasını yazıb Bakıdakı Orucov qardaşlarının elektrik mətbəəsində çap etdirərək, xalqın istifadəsinə verməyə müvəffəq olmuşdur. Bu kitabçada Şərq musiqisinə dair dəyərli məlumatlar verməklə, doqquz dəsgah və 82 ümumi

musiqi havası göstərilmişdir». (9, 54). Göründüyü kimi, bu epizodik xatirə Qarabağ ədəbi mühitindəki musiqiyə olan marağın tarixi kökləri haqqında düşünməni zəruri edir. Çünki bu mühit və M.M.Nəvvabın yazdığı kitablar birdən-birə yaranmamış, əksinə ənənəvi inkişafın uğurlu yekunu kimi meydana çıxmışdır. Eyni zamanda M.M.Nəvvabın zəngin və çoxşaxəli fəaliyyətinin bu qatının bəzi tərəfləri də aydınlaşmış olur. Ədibin məclislər təşkil etməsi, musiqinin inkişafı ilə bağlı yazdığı əsərlər, etdiyi müraciətlər və s. onun mənəvi zənginliyinin faktları kimi öz təsdiqini tapır. M.M.Nəvvabın musiqiyə, elmə, incəsənətə bu qədər real münasibət göstərməsi onun dünyagörüşünün bütövlüyünü, əqidəsini və amalını meydana çıxarır.

Nəvvabın sufi ideyalarla silahlanması, ilahi eşqə bağlılığı onun şeirlərinin qayəsini təşkil etmiş və o, Şuşada dini təziyyələrin təşkilatçısı kimi də fəaliyyət göstərmiş, bəlkə də onu ifa edənlərdən biri olmuşdur. Çünki deyilənlərə görə, onun məlahətli səsi var imiş. Aşağıdakı misralar da bunu deməyə əsas verir:

Bir belə zəngulələri, boğaz səsləri, yoğun səsləri,
Bir belə ağlı, biliyi, kəmali nə edim? (130, 241).

Bu deyimin özündə böyük həqiqət var. El ağsaqqallarının söyləmələrində, xalq arasında yaşayan əhvalatlarda M.M.Nəvvabın məlahətli səsi, zəngulələri haqqında maraqlı fikirlər yaşayır. Deyilənə görə, Şuşada «Xıdır Nəbi» gecəsi, «Novruz bayramı», «Aşura günü» səhnələşdirilmiş şəkildə təntənə ilə keçirilərmiş. Hətta ətraf kəndlərdən xalq axın-axın buraya gələr və tamaşalara diqqətlə qulaq asarmışlar. Nəvvabın bu mövzuda əsər yaratması da o dövrün aktual reallığıdır. Onun sulu boya ilə çəkdiyi «Şuşada Aşura mərasimi» adlı 2 əsəri R.Mustafayev adına Respublika Incəsənət Muzeyində saxlanılır. Həmçinin bu mövzuya həsr

etdiyi bir sıra əsərlər içərisində «Məzlumnamə» daha çox diqqəti cəlb edir. Əsərdə gözəl növhə, çarparə növhə, fərd, əfrad, mərsiyə, sinəzən, tövbənamə və s. janrda şeirlər vardır. Bunlar onun zəngin yaradıcılığının bir qatıdır, ədibin hansı ideallarla yaşamasını, hansı düşüncəyə sahibliyini aydınlıqla ifadə edir.

Şərq və türk, Azərbaycan musiqi tarixinin, yaxud onlarla bağlı zəngin ənənələrin öyrənilməsində M.M. Nəvvab yaradıcılığı əvəzsizdir. Böyük zəkaya sahib olmanın nəticəsi idi ki, o müxtəlif istiqamətli fəaliyyətinin bütün tərəflərində yeni düşüncə, yeni keyfiyyət nümayiş etdirirdi. Dini mövzulu şeirlərində də, din adamı kimi dinin qaynaqlarını, onun təbliğ etdiyi idealları öyrənməkdə də həmişə orijinal mövqe tuturdu.

XIX əsrdə Şuşa Qarabağ ədəbi-mədəni mühitinin mərkəzi olmuşdur. Qarabağ xanlığının bünövrəsi, təxti-tacı Şuşada yerləşirdi. Burada elm, musiqi, sənətkarlıq, adət-ənənələrə bağlılıq da dərin iz qoymuşdur. Bu baxımdan dini adətlərin geniş vüsət tapdığı Şuşa şəhərində hər məhəllənin öz məscidinin olması heç də təsadüfi deyildir. Bu, bizim milli varlığımızın izləri idi. «Təsadüfi deyildir ki, təkcə XIX əsrdə istedadlar məskəni olan bu şəhərdə 95 şair və ədib, 22 musiqişünas, 38 xanəndə, 12 nüsxəbənd, 19 xəttat, 16 nəqqaş, 18 memar, 5 astronom, 16 həkim, 42-yə qədər müəllim və sairə olmuşdur (bax: «Kommunist» qəzeti, 8 avqust 1945-ci il). Bu böyük ziyalı dəstəsi Şuşa şəhərini mədəniyyət mərkəzinə çevirməkdə və inkişaf etdirməkdə böyük rol oynamışdır». (153, 29). Bu ziyalılardan biri də güclü biliyə və bacarığa malik olan M.M.Nəvvab idi. Çoxsahəli və çoxşaxəli yaradıcılığı ilə xalqın sevimlisinə çevrilmişdir. «Şuşada musiqi elminin inkişafında Nəvvabın müstəsna xidməti olmuşdur. Məlum olduğu üzrə, xanəndə

sənətinin inkişafında mühüm rol oynamış amillərdən biri də XIX əsrin ikinci yarısında Azərbaycanda təşkil olunmuş ədəbi və musiqi məclisləri idi. Məşhur musiqişünas xarrat Qulunun ölümündən sonra (1883) Şuşada XIX əsrin 80-ci illərində Kor Xəlifə musiqi məktəbi açmışdır. O, tələbələrə muğam oxumağı və tar, kamança çalmağı öyrədirdi. Kor Xəlifənin məktəbi bir çox musiqiçilər yetişdirmişdir. Lakin Kor Xəlifənin ölümündən sonra məktəb bağlanır. Bunu görən M.Nəvvab XIX əsrin 90-cı illərində böyük xanəndəmiz Hacı Hüsünün yaxından iştirakı ilə Şuşada «Musiqişünaslar məclisi» yaradır. XX əsrin əvvəllərində isə Molla Ibrahimin musiqi məktəbi meydana çıxır. Nəhayət, 1905-ci ildən sonra Nəvvab yenidən şəhərin musiqi həyatında böyük rol oynayır. O, Şuşanın açıq fikirli ürəfalarını, istedadlı gənclərini ətrafına toplayıb hücrə açır. Həmin hücrəyə yığılan tərəqqisevənlər və ziyalılar həyatın müxtəlif sahələrindən: poeziyadan, musiqidən, tarixdən söhbət edərdilər. Nəvvabın hücrəsi Xarrat Qulunun musiqi məclisindən və Xurşid Banu Natəvanın «Məclisi-üns»ündən sonra şəhərin ədəbi və musiqi həyatında mühüm rol oynamış və bir növ mədəniyyət universitetinə çevrilmişdir» (153, 35).

Bu özlüyündə Qarabağ ədəbi mühitinin zənginlik faktıdır. Orada olan yaradıcılıq istiqamətlərini aşkarlayır. Eyni zamanda onu deməyə əsas verir ki, bu mühit təkcə poeziya ilə məhdudlaşmır. Burada bir-birindən zəngin olan tarixi ənənələrlə səciyyələnən daha xarakterik tərəflər var. Bu isə bütövlükdə elmin, mədəniyyətin, ədəbiyyatın inkişaf faktı idi. Sadəcə olaraq Qarabağda onun təşəkkülü və yeni uğurlar qazanması üçün münbit şərait yaranmışdır. Bu mənada XIX əsr Qarabağ ədəbi mühiti musiqinin, ədəbiyyatın yeni dəyərlər qazanması üçün intibah

funksiyası yerinə yetirir. Bunu həmin dövrdə yaranan ədəbi məclislər, musiqi məktəblərinin təşkili, qəza məktəblərində görülən böyük işlər və s. də aydınlıqla göstərir. M.M.Nəvvab da məhz həmin mühitin yetirməsi kimi bütün fəaliyyəti ilə elmə, maarifə, ədəbiyyata, islam dininə və dünyəvi dəyərlərə xidmət etmişdir. Onun bir-birindən mövzu və mündəricə ilə fərqlənən kitabları da bunu aydınlıqla göstərir. Onun isə mühüm qatını, əsas istiqamətlərindən birini və bəlkə də başlıcasını poeziya təşkil edir. Mir Möhsün Nəvvab da bir şair, təzkirəçi, ədəbi məclis rəhbəri kimi xüsusi olaraq burada açılır. Eləcə də Qarabağ ədəbi mühiti bir lay kimi poeziyanın XIX əsrdəki yüksəlişi ilə ədəbiyyat tarixində böyük uğurlarla xarakterizə olunur. Bu ikinci istiqamət ədəbi məclislərdə və təzkirəçilik ənənəsində özünün geniş əksini tapır.

XIX əsrdə Mir Möhsün Nəvvab kimi alim, pedaqoq klassik ideyalara sadiq qalmış, xalq kütlələrinin savadlanması, sağlam böyüməsi üçün bacarıq və imkanlarını səfərbər etmiş, əsil insan, kamil bir şəxsiyyət kimi var qüvvəsini əsirgəməmişdir. Odur ki, Nəvvab xalqın qəlbində özünə əbədi yuva qurmuş, hər kəsə nəsib olmayan şöhrət qazanmışdır. Bunun nəticəsidir ki, xalq arasında Nəvvab haqqında müxtəlif lətifələr, rəvayətlər bu gün də yaşamaqdadır.

O, ekstrasens biliyə malik olub, hadisələri qabaqcadan görə bilirmiş. Müəmmalı işləri aşkarlayaraq, haqq yolunda bacarığını heç vaxt əsirgəməmişdir. Bu xüsusiyyəti ilə bağlı mənbələr də məlumat verir. Bununla bağlı xalq arasında maraqlı söhbətlər danışılmaqdadı. Onlardan birində deyilir ki, bir nəfərin qardaşını öldürüb gizlədirlər. Qardaşı öldürülən qatili öyrənmək məqsədi ilə Nəvvaba müraciət edir. O məsləhət görür ki, bu məsələni məndən soruşma, çünki səni dəhşət gözləyir, sən ölə bilərsən. Lakin həmin adamda intiqam

hissi o qədər güclü olur ki, dəfələrlə Nəvvaba müraciət edir və bu işin aşkarlanmasını təkid edir. Nəvvab çarəsiz qalıb ona deyir ki, axşam şər qarışanda çəpərinizin yanında qardaşın səni gözləyəcək, nə lazımsa soruşarsan. Həmin adam axşam qaranlıq düşəndə bir neçə yoldaşla Nəvvab dediyi yerə gedir və qardaşını uzaqdan görür. Qardaşından onu kim öldürdüyünü və hara basdırıldığını soruşur. Sonra qardaşına tərəf yaxınlaşmaq istədikdə o, qeyb olur. Səhər adamlar bu söhbətin nəticəsi ilə maraqlanırlar və meyidi həmin çəpərin yaxınlığından çıxarırlar. Qatillər etiraf edirlər ki, biz öldürmüşük. Nəticədə Nəvvabdan bu hadisənin şərhini soruşan qardaşın da ürəyi partlayıb ölür. M.M.Nəvvab gizlinləri açmaqda, oğurluqları tapmaqda da mahir imiş. O, qabiliyyəti, fərdi bacarığı ilə oğurlanan əşyanı taparmış. Qarabağ ədəbi mühitinin yetişdirdiyi bu böyük zəka sahibi Şuşada doğulub, həmin ədəbi-mədəni mühitdə tərbiyələnmiş və orada da 1919-cu ildə vəfat etmişdir.

## 2.2. M.M.Nəvvabın maarifçilik fəaliyyəti

M.M.Nəvvabın çoxşaxəli fəaliyyətinin mühüm bir hissəsini pedaqoji fəaliyyəti təşkil edir. Pedaqoji fikrin inkişafında, dərslik ənənəsinin zənginləşməsində onun xidmətləri əvəzsizdir. Bunu ilk öncə onun yaratdığı məktəblərdəki tədris üsulu, yazdığı dərslikləri və ona çəkdiyi illüstrasiyalar aydınlıqla göstərir. XIX əsrin ikinci yarısında pedaqoji fikrin təşəkkülündə mühüm xidmətləri olan M.M.Nəvvab Şuşada yeni tipli məktəblərin yaradılmasında da böyük rol oynamışdır. Beləliklə, Şuşada məscidlərin yanında fəaliyyət göstərən mədrəsə məktəbləri ilə yanaşı, yeni təlim və təhsil sisteminə əsaslanan dövlət və xalq məktəblərinin yarandığı bir dövrdə Nəvvab elmi, ədəbi və pedaqoji fəaliyyətini daha da gücləndirmişdir. Hətta maraqlıdır ki, Zaqafqaziyada ilk qəza məktəbi Azərbaycan ərazisində 1830-cu il dekabrın 31-də Şuşada açılmışdır.(44, 6). Daha sonra bu istiqamət genişlənir, inkişaf edir və 30 ildən sonra Şuşa qəzasında 27 məktəb fəaliyyət göstərir (45, 41). 1874-cü ildə Şuşa qəza məktəbi 3 siniflik şəhər məktəbinə çevrilir. 1875-ci il oktyabrın 26-da xeyriyyə cəmiyyəti Şuşada qız məktəbinin əsasını qoyur və bu məktəbin adı 1894-cü ildə dəyişdirilərək Marinski qadın məktəbi adlanır. 1870-ci ildə Şuşada Həsənəli Qarabaği və sonra təxminən 1892-ci ildə isə M.M. Nəvvab yeni məktəb açmışdır. (155, 4).

Nəvvabın açdığı bu məktəb «Gövhəriyyə» adlanırdı. Orada klassik ədəbiyyatla yanaşı, tarix, fəlsəfə, məntiq, coğrafiya, astronomiya və həndəsə elmlərinin tədrisinə xüsusi diqqət yetirilmişdir. Bu baxımdan Nəvvab əsərlərinin bir çoxunu dərs vəsaiti məqsədi ilə yazmışdır. Onun 500 nəsihətdən ibarət «Nəsihətnamə», «Kifayətül-ətfal», «Cəfri-camei-Murtəzəvi» kimi əsərləri gənc nəslin elm, təhsil və tərbiyəsinə uzun illər

xidmət etmiş və bu gün elmi, tarixi və pedaqoji xarakteri ilə çox dəyərlidir. Ümumiyyətlə, M.M.Nəvvabın uşaqlar üçün yazdığı şeirlər, nəğmələr və nağılların müəyyən yaş qrupları üçün nəzərə alınması göstərir ki, onun pedaqoji fəaliyyətində yaşa müvafiqlik, kitablara çəkdiyi şəkillər, təlimdə əyanilik, əqli-estetik və fiziki tərbiyə məsələləri bütün çap kitablarının əsas məqsədini təşkil etmişdir.

Bundan bir il sonra Qori Müəllimlər Seminariyasının məzunu Camal bəy Fətəlibəyov 1893-cü il mart ayının 18-də Şuşada «yoxsul uşaqların oxuması üçün» «Rus-müsəlman» məktəbi tipində məktəb açır.(3, 26) Məktəb şəbəkəsinin Şuşa kimi şəhərdə genişlənməsinə diqqət, məhz, xalqın qabaqcıl ziyalılarının təzyiqi nəticəsində mümkün olmuşdur. Təkcə 1901-ci ildə Gəncə quberniyasının Şuşa qəzasında 6 ibtidai xalq məktəbinin təsis edildiyi bu fikri bir daha təsdiq edir.(45, 35). Ümumiyyətlə, XIX əsrin sonlarında başlanan məktəb quruculuğu və xalqın maariflənməsi hərəkatında M.M.Nəvvabın xidmətləri böyük yer tutur. Bu böyük ədib açdığı «Üsuli-cədid» məktəbində müəllim olmaqla kifayətlənməmiş, dərs dediyi şagirdlər üçün dərsliklər yazaraq nəşr etmiş və onu yoxsul uşaqlarına pulsuz paylamışdır.

Şuşada məktəblərin şəbəkəsi genişləndikcə dini elmlərin tədrisi ilə yanaşı, dünyəvi elmlərin də uşaqlara öyrədilməsi, dərslərin bir neçə məktəb istisna olunmaqla, əsasən, ana dilində keçirilməsi əhali arasında məktəbə rəğbəti daha da artırırdı. Həsənəli xan Qarabaği, M.M.Nəvvab və N.Vəzirov kimi dövrünün tanınmış ziyalılarının Şuşada məktəb açması, ümumiyyətlə, onların xalq arasında olan nüfuzu cəhalət və zülmət dünyası olan savadsızlığa zərbələr vurmuşdu. Məlumdur ki, ana dilində dərslik və dərs vəsaitlərinin nəşri məsələsi XIX əsr Azərbaycanın ən görkəmli

ziyalılarını narahat edən ciddi bir məsələ idi. M.M. Nəvvabın isə uzaqgörənliyi onda olmuşdur ki, o, M.F. Axundovun, M.Ş.Vazehin və başqa sələflərinin məktəb təşkil etmək arzusunu öz şəxsi fəaliyyətində həyata keçirə bilmişdir (54, 8).

M.M.Nəvvabın bədii, elmi və maarifçilik fəaliyyətində kitab çapı xüsusi yer tutur. Onun Azərbaycan kitab mədəniyyətinin və çapçılıq sənətinin inkişafında xidməti daha geniş və hərtərəfli olmuşdur.Rəssam və xəttat, həm də dekorativ sənət ustası kimi kitab tərtibatı sahəsində bütün işləri özü görmüşdür. Əsərlərinin əksəriyyətini öz mətbəəsində çap etməklə yanaşı, başqa müəlliflərin də əsərlərini nəşr etmişdir. Nəvvabın çapçılıq fəaliyyəti o qədər geniş və əhatəlidir ki, orada bu işə cəlb olunmuş şagirdlərdən başqa, püxtələşmiş sənətkarlar da olmuşdur. Görkəmli ədibi çapçılıq fəaliyyətində öz müasirlərindən fərqləndirən əsas cəhətlərdən biri bu idi ki, o, gözəl rəssam və xəttat idi.

M.M.Nəvvabın hazırladığı xalq sənəti nümunələri forma-biçiminə, bədii tərtibatına görə seçilir. R.Mustafayev adına Azərbaycan Dövlət Incəsənət Muzeyində onun öz əli ilə hazırladığı iki rəhil saxlanılır. Ümumi quruluşu nisbətən sadələşdirilmiş, eyni zamanda, səthi nəbati naxışlarla örtülmüş bu rəhillər istifadə üçün çox rahat və əlverişlidir. Muzeydə onun hazırladığı bir qələmdan da nümayiş etdirilir. Düzbucaqlı formalı qələmdanın üzəri istirahət mövzulu süjetlərlə bəzədilmişdir. Şərti olaraq üç hissəyə bölünmüş şaquli kompozisiyada gəzintiyə çıxmış şuşalı gənclər təsvir olunub. Kompozisiyalara daxil edilmiş memarlıq tikililəri, gənclərin zəngin geyimləri həmin dövrün milli koloritini duymağa kömək edir. M.M.Nəvvabın eyni zamanda xalq tətbiqi sənətinin başqa sahələrində

fəaliyyət göstərdiyi də məlumdur. Müasirlərinin xatirələrində qeyd olunur ki, o, neçə-neçə bədii oyma, tikmə, xalçaçılıq çeşnilərinin də müəllifi olmuşdur.

Digər tərəfdən onun bu xeyirxah işi Qarabağda pedaqoji fikrin təbliği və tədrisi ilə bağlı idi. Şuşada ictimai şüur formalaşıb inkişaf etdikcə maarifçilik genişlənir, məktəblərin sayı artır, əhalinin kasıb təbəqələrinin uşaqları oxumaq imkanına malik olurdular. Uşaqların əksəriyyəti xalq məktəblərinə, xüsusən, M.M.Nəvvabın «Üsuli-cədid» məktəbinə cəlb olunur, ucuz dərslik, qələm, mürəkkəb və başqa dərs vəsaitləri ilə təmin edilirdi. Imkansızlara isə pulsuz verilirdi.

Onun çapçılıq fəaliyyəti kitabxanaçılıq işi ilə, Bakıda və başqa yerlərdə nəşr olunmuş ədəbiyyatın təbliği ilə də sıx bağlı idi. Bütün bunlar göstərir ki, M.M. Nəvvab məktəbdarlıq, maarifçilik, çapçılıq, kitabxanaçlıq və təbliğatçılıq işlərini kompleks halda bir-biri ilə üzvi surətdə birləşdirmiş və nəinki dərs dediyi şagirdləri, eləcə də şəhər əhalisinin savadlanmasına xidmət göstərməyi özünə mənəvi borc bilmişdir. Bütün bunlar onu göstərir ki, M.M.Navvabın «Nəfis xətlə yazdığı əlyazmaları və şəxsi mətbəəsində litoqrafiya üsulu ilə çap etdiyi kitabların bədii tərtibatı, XIX əsrin sonu və XX əsrin əvvəllərində Azərbaycanda kitab nəşri və tərtibatının inkişafında əhəmiyyətli rol oynamışdır».(22, 217).

Kitabşünas alim dos. H.Həsənov «Azərbaycan kitabının inkişaf mərhələləri» adlı əsərində göstərir ki, litoqrafiya Azərbaycana 1824-cü ildə gətirilmişdir. Bu çap üsulu ilə elmə məlum olan ilk çap kitabı Şuşada 1835-ci ildə «Kitabi-mizanülhəqq, yəni təxsisül-incil vəl-Quran ki, dər qəleyn-Şuşa» adı ilə çap olunmuşdur. Bundan 50 il sonra M.M.Nəvvabın çapçılıq fəaliyyətinin ilk məhsulu

Haşımzadə Ağa Mir Mehdi Xəzaninin 48 səhifədən ibarət 1884-cü ildə çap etdiyi «Şəriətil-islam» kitabıdır. Sonra Nəvvab öz əsərlərini çap etməyə başlayır. «Kitabi-divani-farsi min mövzuat və mənzumati-cənabi-Nəvvab» (1896), «Kitabi-kəşfül-həqayiq» (1896), «Divani-farsi» (1897), «Dibaçeyi-divani-farsi» (1898), «Kitabi-Türki, əşari-Nəvvab» (1898), «Kitabi-kəşkül-həqiqeyi-məsnəvi» (üç cilddə) (1898-1899), «Mərsiyə və qəzəllər» (1898) və s. əsərlərini öz litoqrafiyasında çap etmişdir. M.M.Nəvvabın kitab çap etmək texnologiyası çətin və çox zəhmət tələb edən bir iş olduğundan bu işdə ona həmişə oğlu Miriş Ağa yaxın köməkçi olmuşdur.

Əsası XIV əsrdə Təbriz rəssamlıq məktəbi tərəfindən qoyulmuş kitablara miniatürlər çəkilməsi ənənəsi M.M.Nəvvabın fəaliyyətində, naşirlik və tərtib işlərində də özünü göstərir. Məhz bütün bunların nəticəsi olaraq o, XIX əsrin sonu və XX əsrin əvvəllərində Azərbaycanın ən yaxşı kitab tərtibatçısı hesab edilir. Daha doğrusu, kitab tərtibatı sahəsindəki fəaliyyəti ilə M.M.Nəvvab Azərbaycanda qrafikanın inkişafında və kitab tərtibatı sahəsində çalışan ilk kitabşünas alim olmuşdur. Çapçılıq, rəssamlıq fəaliyyəti və maarifçilik ideyaları, onun alimliyi, müəllimlik və məktəbdarlıq fəaliyyəti ilə sıx bağlı olmuşdur.

M.M.Nəvvabın çoxşaxəli fəaliyyətinin bir hissəsini qiraətxana açması və kitab təbliği sahəsindəki əməli tədbirləri təşkil edir. Onun ədəbi-bədii fəaliyyəti 1872-ci ildə təşkil etdiyi «Məclisi-fəramuşan»la daha çox bağlı olmuşdur. Həmin məclis üzvlərinə təqdim olunan əsərlərin əksəriyyətinin bir nüsxəsinin «Məclisi-fəramuşan»ın rəhbəri olan M.M.Nəvvabda qalması onun kitabxanasının zənginləşməsinə şərait yaratdı. Təxminən o dövrdən də Nəvvabın iş otağı məclis üzvlərinin ən sevimli qiraətxanasına çevrildi. Buradan

belə bir nəticəyə gəlmək olur ki, Şuşada ilk kitabxananın təşəbbüskarı və onu qismən də olsa təşkil edən M.M.Nəvvab olmuşdur. Demək, Şuşada ilk kitabxana XIX əsrin 80-ci illərində M.M.Nəvvabın evində fəaliyyətə başlamışdır. Belə bir yararlı işin əhəmiyyətini dərk edən fransız dili müəllimi Əhməd bəy Ağayevin təşəbbüsü ilə 1897-ci ilin yanvar ayının 26-da kitabxana təşkil edilmişdir (65,27-28). Bir ay sonra 1897-ci ilin fevral ayında X.Natəvanın oğlu Mehdiqulu xan Vəfanın (1856-1900) təşəbbüsü ilə yeni bir kitabxana təşkil olunur. Kitabxanaya Mehdiqulu xan Vəfa 300 rubl pul vermişdir. «Qafqaz» qəzeti 18 fevral 1897-ci il tarixli nömrəsində bu haqda məlumat verərək bildirir ki, kitabxanaya şəhərdə yerləşən rus əsgərlərinin hakimi V.V.Smirnov da 20 kitab və 10 manat pul hədiyyə etmişdir (126).

Şuşada qiraətxana açmaq, kitab və mətbuatı təbliğ etmək, litoqrafiya üsulu ilə kitab nəşri və s. kimi məsələlərdə, maarifçilik ideyalarının həyata keçirilməsində M.M.Nəvvabın ən yaxın məsləkdaşı oğlu Mir Ibrahim (1871-1948) olmuşdur. Onu xalq arasında Miriş Ağa deyə çağırarmışlar. M.M.Nəvvab «Təzkireyi-Nəvvab»da oğlu haqqında məlumat vermiş və hətta onun doğulduğu zamanın müəyyən anını da qeyd etmişdir: «Mir Ibrahim Mir Möhsün Nəvvabın oğludur. Qarabağın Şuşa şəhərində 28 rəbbi-üs-sani, 1288-ci ildə, gün çıxandan 3 saat 52 dəqiqə keçmiş, Sünbülə bürcünün 9-cu dərəcəsində anadan olmuşdur... Farsca, ərəbcə, rusca, fransızca oxuyur» (130, 428). O, oğlu Miriş Ağaya özü təhsil vermişdir. Onun çox dil bilməsi məhz çoxşaxəli fəaliyyətinə kömək etmişdir. Miriş ağa atasının təşkil etdiyi «Məclisi-fəramuşan» ədəbi məclisinin üzvü olmuşdur».(137,34). M.M.Nəvvabın 1903-cü ildə yuxarı Gövhər Ağa məscidinin həyətində açdığı kitabxana - qiraətxanaya da Miriş Ağa rəhbərlik etmişdir. O, 1905-

1906-cı illərdə Şuşada erməni-müsəlman davasında qoşun birləşmələrinə qarşı cəsarətlə vuruşan 3-cü səngərə başçılıq etmişdir. Bu haqda M.M.Nəvvab «1905-1906-cı illərdə erməni-müsəlman davası» (128) əsərində geniş məlumat vermişdir.

Miriş Ağa da atası kimi xalqın maariflənməsi, mədəniyyətin inkişafı üçün daima çalışmışdır. Ata və oğul tərəfindən təşkil olunmuş qiraətxana əsasında Şuşada 1920-ci ildə ilk kütləvi şəhər kitabxanası təşkil edilmişdir (126). Bu kitabxana 1924-cü ildə naməlum səbəbdən yanmışdır. Burada nəinki Şuşaya, Qarabağa, eləcə də, ümumən Azərbaycan tarixinə aid ən qiymətli əlyazmalar, minlərlə kitab məhv olmuşdur.

Miriş ağa həm də atası Nəvvabın əsərlərinin Şuşada və Bakıda nəşrini təşkil edən ilk naşir idi. Bakıda Orucov qardaşlarının elektrik mətbəəsi ilə əlaqə saxlayaraq atasının «Təzkireyi-Nəvvab», «Vüzuhül-ərqam», «Məzlumnamə» əsərlərinin nəşrində Miriş Ağanın xidmətləri böyük olmuşdur.

O, Şuşada, eləcə də Qarabağda kitab ticarəti ilə məşğul olan ilk adamdır. Orada siyasi ədəbiyyatı yayan da Miriş Ağa olmuşdur.

Ümumiyyətlə, M.M.Nəvvabın çoxşaxəli fəaliyyətində mədəni-maarif və mətbuat işi ilə bağlı məsələlər də geniş yer tutur. Azərbaycanda nəşr olunan «Əkinçi», ««Ziya» və «Ziyayi – Qafqaziyyə», «Iqbal», «Səda», «Irşad», «Molla Nəsrəddin» və Hindistandan «Həblül-mətn» jurnallarını Şuşaya gətirtdirir və dünya hadisələri ilə şəhər ziyalılarını tanış edirdi (105, 16).

İstər M.M.Nəvvabın, itərsə də oğlu Miriş Ağanın jurnalistik fəaliyyətləri elmi ədəbiyyatda və mətbuatda geniş işıqlandırılmamışdır. Təəssüf ki, bu geniş fəaliyyət hələ də

araşdırmadan kənarda qalmaqdadır. O, elmi yaradıcılıqla, mətbuatla, kitab təbliğinə və şəxsi mütaliəyə geniş diqqət yetirməklə yanaşı, 1880-1884-cü illərdə «Ziya», «Ziyayi-Qafqaziyyə» (1874-1884) qəzetlərinə Şuşada olan vəziyyət haqqında müntəzəm yazılar göndərirdi. Bu isə onu göstərir ki, M.M.Nəvvab jurnalistlika sahəsində də qələmini sınamışdır. Yazılarında məktəblərdəki ağır vəziyyət, vilayətdəki qıtlıq, yoluxucu xəstəlikdən əhalinin qırılması, həkim S.B.Mehmandarovun yoxsullara pulsuz xidmət etməsi və s. kimi aktual məsələlərdən geniş söhbət açmışdır.

M.M.Nəvvabın maarifçilik ideyalarına və pedaqoji fəaliyyətinə görə o, A.Bakıxanov, S.Ə.Şirvani, M.F. Axundov, S.T.Sidqi, M.Ə.Sabir, N.B.Vəzirov, Ə.Haqverdiyev kimi sənətkarlarla bir sırada dayanır. Hətta bəzən onların bu sahədəki nəzəri fikirlərini Şuşa mühitində əməli olaraq həyata keçirmişdir.

M.M.Nəvvab dinə, dini elmlərə bələd olan bir şəxsdir. Bunu onun bütün fəaliyyətində aydınlıqla görmək olur. Şeirlərinin böyük bir qismində mərsiyədarlıq adətləri təcəssüm edilir, dini əfsanə və rəvayətlərdən söhbət açılır. Bu onun məktəbdarlıq işində də, rəsmlərində də, çapçılıq fəaliyyətində də bir istiqamət kimi davamlı olaraq qorunur. M.M.Nəvvab həmçinin mənşə etibarilə mömin bir nəsildən olmuşdur. Və M.M.Nəvvabın M.F. Axundovla yaxınlıq etməsi mənbələrdə vurğulanmır. Şuşa ilə sıx bağlı olan M.F.Axundov X.Natəvanın «xeyir işində» (118,62) olmuş, 6 aydan çox orada tərcüməçilik etmiş və ilk qızını Şuşada Bəhmən Mirzənin oğlu Xanbaba xana ərə vermişdir. Bir sözlə Şuşa ədəbi və ictimai-siyasi mühiti ilə yaxından tanış olan, orada iki əsər yazan, o cümlədən məşhur «Hacı Qara» əsərini də bu mühitdə yaradan bir şəxslə M.M.Nəvvab yaxından tanış olub, əlaqə saxlamaması inandırıcı

görünmür. Onu da qeyd edək ki, xalqın maariflənməsi və tərəqqisi üçün hər iki sənətkarın ideyaları və arzuları üst-üstə düşmüşdür. Hətta M.M.Nəvvab yeni əlifba məsələsində M.F.Axundovun təklif etdiyi layihəni ərəb əlifbası saxlanılmaqla, islahatlar aparıb qəbul etməyin tərəfdarı olmuşdur. Gültəkin Şamilli Mir Möhsün Nəvvabın «Avropa ibtidai musiqi savadı dərsliyi» əsərini aşkarlayıb tədqiq etmiş, əsərin M.F.Axundovun əlifba islahatı ilə uzlaşdığını və hətta əlifba islahatının ilk variantı olduğunu əsaslandıraraq faktları müqayisəli şəkildə əyani olaraq göstərir. Sonra o, Nəvvabın Şuşada təşkil etdiyi məktəblərdən söhbət açır və «Üsuli-cədid»in üstün cəhətlərini qeyd edir. Nəhayət, belə bir nəticəyə gəlir: «Beləliklə, bizim mülahizəmiz məntiqi surətdə tamamlanan sıraya uyğunlaşır: yeni musiqi əlifbası – yeni musiqi nəzəriyyəsi – yeni məktəb. Bu aşağıda göstərilən çox vacib praqmatik məna kəsb edir. Azərbaycan və qonşu müsəlman ölkələri mədəniyyətinə Axundov əlifbasının müvəffəqiyyətli tətbiqi şəraitində yeni pota məna etibarı ilə həmin əlifbanın bir hissəsi kimi Avropa musiqi nəzəriyyəsinin güman ki, məhdud çərçivədə mənimsənilməsinə imkan verə bilərdi. Belə ki, bunun üçün tanış olmayan not işarələrinin, xətlərin və s. öyrənilməsinə ehtiyac qalmazdı». (131, 79).

Ömrünün bütün şüurlu hissəsini xalqının maariflənməsinə, mədəniyyətinə, ədəbiyyatına həsr etmiş tanınmış alim və pedaqoq olan M.M.Nəvvabın əsərləri bizim üçün bir də ona görə qiymətlidir ki, bu əsərlər əvvəla, böyük bir tarixi dövrü əks etdirir, ikincisi, əvəzsiz Şuşa ilə bağlıdır, üçüncüsü, həmin əsərlər o qədər dəyərlidir ki, bu günümüzlə səsləşir və Qarabağşünaslığın həqiqi bədii salnaməsidir.

Nəvvab dünyada yaxşı nə varsa ona qiymət verən bir şəxsiyyət kimi diqqəti cəlb edir. O, insanlığa, hünər sahiblərinə, xalqa faydalı bir iş görənə, rəssamlara, musiqiçilərə son dərəcə yüksək münasibətdə olmuşdur. Bunu onun müxtəlif istiqamətli əsərlərində aydınlıqla görmək olur.

Nəvvab əxlaq nəzəriyyəçisi kimi müəyyən əxlaq prinsipləri yaratmış və bu prinsiplərin astanasında öz mənəviyyatını zənginləşdirmiş, fəaliyyətini qurmuşdur. Mənəviyyatca zəngin olan sənətkar mənfəət məqsədi güdməyən bir həyat fəaliyyətinə malikdir. Nəvvab klassiklər kimi, böyük bir tərbiyə məktəbinin banisi sayıla bilər. Bu ümumi qayənin köklərini araşdırsaq görərik ki, dahi Nizami belə bir xalq tərbiyə məktəbini hələ XII əsrdə yaratmışdır.

# III FƏSİL

# MİR MÖHSÜN NƏVVABIN «TƏZKİREYİ-NƏVVAB» ƏSƏRİ

## 3.1. M.M.Nəvvabın sələfləri

«Təzkirə» ərəb sözü olub, xatırlatmaq, xatirat, tərcümeyi-hal mənalarında işlənir. Ilk öncə onu qeyd edək ki, o, mənəvi dəyərlərimizi öyrənmək baxımından qiymətli məxəzdir. Hər bir xalqın ədəbiyyat tarixinin öyrənilməsində əlyazmalar, cünglər, bəyazlarla yanaşı, təzkirələr də böyük əhəmiyyət kəsb edir. Bu Azərbaycan ədəbiyyatı üçün də belədir. Orta əsrlər ədəbiyyatının öyrənilməsi işinin əsas mənbəyi təzkirələrdir. Onun mahiyyətini və əhəmiyyətini gözəl dərk edən M.M.Nəvvab «Təzkireyi-Nəvvab» əsərinin əvvəlində maraqlı olacaq tərzdə «tarixin səhifələrində bir yadigar kimi qalması üçün Qarabağ şairlərinin əziz adları, onların keçdikləri həyat yolu toplanıb bir təzkirə tərtib edilsin və yüksək ləyaqət və bacarığa malik olmayan mən onların gözəl adlarını zəmanə aqilləri və dövran arifləri üçün yadigar qoydum. Beləliklə, onların buyurduqlarını qəbul edib, onların xahişlərini yerinə yetirib mərdanə işə başladım» (130, 7-8) fikrini söyləyir. Bu iş xalqa sevginin ən böyük ifadəsidir və M.M.Nəvvab yaradıcılığının bəlkə də başlıca istiqaməti kimi görünür. Həmin təzkirə XVIII-XIX əsr Azərbaycan ədəbiyyatını öyrənmək üçün əsaslı məxəzlərdən biridir. Belə ki, Mirzə Yusif Qarabağinin, Adolf Berjenin, Məhəmmədağa Müctəhidzadənin, Hüseyn Əfəndi Qaibovun gördüyü böyük işlər sırasındadır. Qarabağ ədəbi mühitinin XVIII-XIX əsrlər mənzərəsi bu təzkirələrdə kifayət qədər aydınlıqla cəmlənmiş və demək olar ki, ən

əsaslı mənbə rolunu oynayır. Bundan əlavə Iran mənbələrində də Qarabağ mühiti haqqında məlumatlar verilir. Məsələn, Ələkbər Müşiri Səliminin «Zənani-süxənvər», «Təzkirətül-xəvatin», «Nameyi-həftəki» (qəzet) və s. kimi mənbələr bu baxımdan (82, 51) mühüm əhəmiyyət kəsb edir. Bütün verilənlər ədəbi proses haqqında geniş araşdırmalar aparmağa, ictimai-siyasi mühitdən ədəbi mühitə qədər olanlara aydınlıq gətirməyə şərait yaradır. Burada M.P.Vaqifdən M.M.Nəvvaba qədər olan yaradıcı insanların ad silsiləsi var. Məhz Qarabağ ədəbi mühiti və onların ayrı-ayrı şəxsiyyətlərinin yaradıcılığı özünəməxsus xarakterik xüsusiyyətlərlə səciyyələnir. Bunların hər biri isə özlüyündə yaradıcılıq istiqamətləridir. Təzkirəçilik ənənəsini də həmin istiqamətlərin məcmuyu kimi başa düşmək olar. Araşdırmalarda məsələlərə Qarabağ ədəbi mühiti kontekstində yanaşmaqdan daha çox ayrı-ayrı sənətkarların portretlər üzrə işləməyə üstünlük verilib. Halbuki problemlər üzrə aparılan tədqiqat və müqayisəli üsulla həyata keçirilən araşdırma ənənəni izləməyə daha çox şərait yaradardı. Məhz təzkirəçilik ənənəsi də bu sıradadır. Məsələyə təzkirəçilik baxımından həm tarixi, həm də mühit anlamında diqqət yetirmək lazımdır.

Tarixi ənənədə təzkirəçilik iki istiqamətdə – Şərq və türk xalqlarının müstəvisində işləməni zəruri edir. Şərq xalqlarında yüzdən çox təzkirəçinin olduğu, türk xalqlarında isə 30-a qədər təzkirənin məlumluğu bu sahənin nə qədər geniş və zəngin olmasının sübutudur. Biz klassiklərimizi, ərəb və fars dilində yazan şairlərimizi həmin təzkirələrdən daha çox öyrənirik. İbn Qüteybənin «Kitab-əş şeir və şüəra», Əbülfərəc İsfəhaninin «Kitab əl-əğani», Sərabinin «Yetimətüd-dəhr» təzkirələri Azərbaycan şeirinin VIII-X əsrlərdəki olan vəziyyətini xarakterizə edir. Bu

mənada biz təzkirəçilərimizə borcluyuq və onların böyük işlərini savab işi, ədəbiyyat hadisəsi kimi qiymətləndirməliyik. Belə bir ənənənin özü ayrıca tədqiqat problemidir. Anadilli ədəbiyyatımızın öyrənilməsində də həmin təzkirələrin böyük rolu var. Bunlar bir tərəfdən ədəbiyyat tariximizi izləməyə əsas verir, digər tərəfdən də dediyimiz kimi təzkirəçiliyin ayrılıqda ədəbiyyat nümunəsinə çevrilməsi hadisəsidir.

Yaxın və Orta Şərq ədəbiyyatında və eləcə də Azərbaycanda təzkirəçiliyin qədim tarixi, özünəməxsus ənənələri vardır. XII-XIII əsrlərdə Fəridəddin Əttarın «Təzkirətül-övliya» («Övliyaların təzkirəsi»), XIII əsrdə Məhəmməd Övfinin «Lübabül-əlbab», Tahir Xatuninin «Mənaqib əş-şüəra» («Şairlərin mədhi»), XVI əsrdə «Tövbeyi-Sami», XVI əsrdə yazılmış Sadiq bəy Əfşarın «Məcməül-xəvas», XIX əsrdə yazılmış «Təzkireyi-atəşgədə», Məhəmmədağa Müctəhidzadənin «Riyazül-aşiqin», Mir Möhsün Nəvvabın «Təzkireyi-Nəvvab», Müjrüm Kərim Vardaninin «Sünbülüstan», Hüseyn Əfəndi Qaibovun «Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir», Məhəmmədəli Tərbiyətin «Danişməndani-Azərbaycan» və s. adlarını qeyd etmədiyimiz onlarca əsərlər təzkirəçiliyin böyük tarixi və elmi əhəmiyyətə malik olmasından soraq verir. Bu gün də təzkirəçilik xidmətlərinə Dövlətşah Səmərqəndi, Əlişir Nəvai, Əhdi Bağdadi, Sam Mirzə, Lətifi, Sadiq bəy Əfşar, Lütvəli bəy Azər, Məhəmmədağa, Müctəhidzadə, Mir Möhsün Nəvvab, Seyid Əzim Şirvani və Məhəmmədəli Tərbiyət kimi şəxslərin adları iftixar hissi ilə yad edilir. Bu məsələnin bir tərəfidir, onun ikinci tərəfində təzkirənin tərtib və spesifika xüsusiyyətlərinin aydınlaşması dayanır. Daha doğrusu mövcud təzkirələrin müqayisəli

öyrənilməsi, fərqlilik və oxşarlıq məqamlarının açılması aktuallıq kəsb edir.

Qarabağ ədəbi mühitində zəngin yaradıcılıq ənənələri (poeziya, musiqi, rəssamlıq, məktəbdarlıq, kitabxanaçılıq, ədəbi məclislər) həm qorunur, həm də inkişaf etdirilirdi. Onun mühüm tərəflərindən birini həmin zənginliyin bütün cəhətlərdən dərki idi. «Məcmueyi-Vaqif və müasirini-digər» əsərinin müəllifi Mirzə Yusif Qarabaği yazır: «Bu pərişan vərəqlərin müəllifi şan və şöhrət sahiblərinin rəyinə ərz edir ki, Kəmtərin 1828 miladi ilində Iran vilayətində Qarabağa varid oldum və o günlərdə Mirzəcan bəy Mədətovla söhbətim oldu. Onun şeirə çox meyli olub və özünün təbi-şeiri olduğundan, Vaqif təxəllüslü məcmuə təlifinə hümmət etməni mənə təklif etdi» (82, 57). Eyni düşüncəni digər təzkirələrdə, A.Berjedə, M.M.Nəvvabda, M.Müctəhidzadədə və başqalarında da görürük. Bu, F.Axundovun fəaliyyətində, Q.Zakirin yaradıcılığını toplayıb çap etdirmək məqsədilə gördüyü işlərdə də aydınlıqla müşahidə olunur. Məlum olduğu kimi, M.F.Axundov yaxın dostu Q.Zakirin yaradıcılığını vəfat etdikdən sonra toplayıb çap etdirməyə çalışmışdır. Ancaq hansı səbəbdənsə topladığı materiallar sonra A.Berjenin «Məcmuəyi-əşari-şüərayi-Azərabycan»ında əksini tapmışdır. Bu artıq Qarabağ ədəbi mühitində, eləcə də bütövlükdə Azərbaycanda mövcud nümunələrin qorunması qayğısı idi.

M.M.Nəvvab da məhz bu məqsədlə XVIII-XIX əsr Qarabağ ədəbi mühitinin, Azərbaycanın digər ərazilərində yazıb-yaradan şairlərin şeirlərini toplayıb gələcək nəsillərə çatdırmaq yolunu tutur. Belə bir istək XIX əsr Qarabağ ədəbi mühitində bir istiqamət kimi nəzərə çarpır. Geniş yaradıcılıq imkanlarına məxsus M.M.Nəvvabın

fəaliyyətinin mühüm bir hissəsini təzkirəçilik fəaliyyəti təşkil edir. O bu böyük işi ilə Azərbaycan xalqının yaddaşına, Azərbaycan tarixinə öz adını yaza bilmişdir. Onun belə bir fəaliyyəti bədii nümunələrin itib-batması təhlükəsini aradan qaldırmaq istəyindən irəli gəlmişdir. Məhz M.M.Nəvvabın özü də bu işi görmək istəyinin səbəbini belə izah edir: “Bu gözəl dövranda, mübarək 1309-cu ildə görkəmli din qardaşlarından və səmimi ruhanilərdən bəziləri belə arzu etdilər ki, tarixin səhifələrində bir yadigar kimi qalması üçün Qarabağ şairlərinin əziz adları, onların keçdikləri həyat yolu toplanıb bir təzkirə tərtib edilsin”(130,7-8). Burada görkəmli ədib öz məqsədini, eyni zamanda təzkirə yaratmanın səciyyəvi xüsusiyyətlərini çox aydınlıqla ifadə etmişdir. Bu, M.M.Nəvvab dünyagörüşünün, həyat ideallarının bir hissəsi kimi görünür. Eyni zamanda bütün Şərq xalqları ədəbiyyatının amallarına xidmət etməni ifadə edir.

Təzkirəçilik ənənəsi üçün bir xüsusiyyəti də qeyd edək ki, burada maraq doğuran oxşarlıq və fərqlilik keyfiyyətləri var. Yəni onlar ümumi kontekstdə bir-biri ilə qovuşsalar da, fərqliliklərdən uzaq da deyillər. Belə ki, hər təzkirə yazan əvvəlkilərin yolunu tutmaqla əlavələrini də etmişdir. Bu mənada təzkirəçilik tarixi prosesdə boy artımında, yeni keyfiyyət və xüsusiyyətlər qazanmada görünür. M.M.Nəvvabda da həmin vəziyyət müşahidə olunur.

Məlumdur ki, Yaxın və Orta Şərq ədəbiyyatında, o cümlədən Azərbaycanda orta əsrlərdə, eləcə də sonrakı dövrlərdə meydana çıxmış təzkirələr öz quruluşu, həcmi, tərtib prinsipləri baxımından biri digərindən fərqlənir. Bütün bunlara nəzərən klassik ənənələri davam etdirən M.M.Nəvvab təzkirə janrına yeni mövqedən yanaşıb özünəməxsus tərzdə dolğun bir təzkirə formalaşdırmışdır.

O, bu işə yaradıcılıqla yanaşmış, təzkirə janrını inkişaf etdirərək ədəbi-bədii və elmi çalarlarla zənginləşdirmişdir. Bu barədə f.e.n. Ə.Bağırov yazır: «Təzkirədə Nəvvabın öz xəttindən əlavə, iyirmiyə qədər şairin də avtoqrafları təqdim edilir. Azərbaycan əlyazma kitabı tarixində avtoqraf nüsxələri tədqiq edən gənc tədqiqatçı G.Qayıblının qeyd etdiyinə görə, təzkirələrə avtoqraf vərəqlərin daxil edilməsi ideyası, nəinki, Azərbaycanda, bəlkə də bütün Yaxın Şərqdə Mir Möhsün Nəvvaba aiddir. (130, 5) Bundan əlavə təzkirə ədəbi prosesdəki qarşılıqlı münasibətləri, yaradıcılıq əlaqələrini izləmək üçün də kifayət qədər material verir. Çünki burada ayrı-ayrı şairlərin yaradıcılığından müxtəlif nümunələrin verilməsi məsələnin bir tərəfi kimi görünür. Onun ikinci tərəfində müraciətlər dayanır. Məsələn, M.P.Vaqifin, Q.Zakirin, M.Aşiqin, M.H.Mirzənin, Aşıq Pərinin, eləcə də özünün müxtəlif münasibətlə müasirlərinə müraciəti var. Bunlar ədəbi prosesi, ictimai-siyasi və ədəbi mühiti öyrənməyə şərait yaradır.

Təzkirənin maraqlı, diqqətəlayiq cəhətləri çoxdur. Belə ki, bir çox şeirlərin nə münasibətlə yazılması o dövrün ədəbi prosesini izləmək, şairlərin həyat və yaradıcılığını ətraflı öyrənmək baxımından olduqca dəyərlidir. Müəllif bu əsərində təkcə şair və ədiblərlə kifayətlənməyib, öz dövrünün ustad xəttatları, nəqqaşları, müğənni və musiqiçiləri haqda da maraqlı məlumatlar verir. Nəvvabın gözəl müşahidə qabiliyyəti, təhlil bacarığı imkan vermişdi ki, o, öz təzkirəsində hər bir şəxsin qısa, lakonik ədəbi portretini, görüş və maraq dairəsini çox məharətlə təsvir edib, əsərlərinə qiymət verə bilsin. Məhz bütün bu xarakterik xüsusiyyətlərin nəticəsidir ki, f.e.n.Ə.Bağırov belə yazmışdır: «Təzkireyi-Nəvvab» yazıldığı vaxtdan daim oxucu və tədqiqatçıların diqqət mərkəzində olmuşdur. XIX

əsr ədəbiyyatı haqda söz demək istəyən, araşdırma aparan bircə alim də bu təzkirəsiz keçinməmiş, ona mötəbər bir mənbə kimi istinad etmişdir…» (130, 5).

Bu bütövlükdə təzkirə ənənəsi üçün xarakterikdir, yəni hər bir tədqiqatçı öz araşdırmasında ilk öncə həmin mənbəyə diqqət yetirir. Təzkirə faktları dəqiqləşdirmək, ədəbi prosesə qiymət vermək baxımından ilkin mənbədir. Tədqiqatçıların istinad etdiyi bu mənbə eyni zamanda müqayisələrə şərait yaradır. Məsələn, XVIII-XIX əsr Qarabağ ədəbi mühitini öyrənmək anlamında bu təzkirələr müqayisələri də zəruri edir. F.Köçərli «Azərbaycan ədəbiyyatı» kitabında məhz bu yolu tutmuşdur.

M.M.Nəvvab öz təzkirəsində yalnız şairləri deyil, elmin və sənətin müxtəlif sahələrinə sahib olan şəxslər haqda da məlumat verir. Odur ki, «Təzkireyi-Nəvvab» təkcə ədəbiyyat tarixi üçün deyil, əvvəl qeyd etdiyimiz kimi eyni zamanda musiqi, xəttatlıq, tərcüməçilik və s. sahələri də öyrənmək baxımından tutarlı məxəzdir. Ona görə də bu əsər başqa bir baxımdan təkcə ədəbiyyat tarixini, Qarabağ şairlərini öyrənmək işi ilə yekunlaşmır. Eyni zamanda mühitin digər yaradıcılıq sahələrini də əhatə edir. Bu mənada o, özündə çox zəngin bir informasiya layını qoruyub saxlayır. Ədəbiyyatçılar üçün «Təzkireyi-Nəvvab» nə qədər dəyərlidirsə, musiqişünaslar, xəttatlar, tarixçilər üçün də bir o qədər əhəmiyyətlidir. Bu əsəri yazmaqla Nəvvab təzkirəçilik ənənəsinə novatorluqla yanaşmış və ilk dəfə olaraq təzkirəyə avtoqraf yazdırmışdır.

Qarabağ ədəbi mühitini işıqlandıran, onun aşkarlanması və təshihi üçün elmi məxəz olan «Təzkireyi-Nəvvab» əsəri M.M.Nəvvabın şah əsələrindən biridir. O, əsəri 1309-cu ilin rəbi-ül-əvvəl ayında (1891-ci ilin noyabr ayı) başlayıb 1310-cu il səfər-əl-müzəffər (1892-ci il s-

entyabr) ayında bitirmişdir. F.e.n. Ə.Bağırov «Təzkireyi-Nəvvab»ın 1998-ci il çapına yazdığı ön sözdə də həmin məsələlərə diqqət yetirir. Eyni zamanda Əlyazmalar Institutunda M.M.Nəvvabın əlliyə qədər əlyazma kitabının olduğunu vurğulayır. Bu isə özlüyündə mətnşünaslıq baxımından ədibin yaradıcılığının xüsusi tədqiqata ehtiyacı olduğunu göstərir. «Təzkireyi-Nəvvab» da bu sıradadır. «Bu təzkirənin yazılması XIX əsr Azərbaycan ədəbiyyatı, ən əsası isə Şuşa ədəbi mühiti ilə sıx bağlı olub» (130,4), eyni zamanda mövcud əlyazmalar avtoqraf nüsxə olması xüsusiyyəti ilə seçilir. Burada müəyyən mənada tarixilik prinsipinə riayət olunub. Sənətkarların hər biri haqqında qısa məlumat verilir. Digər bir cəhəti də qeyd edək ki, verilən şeir nümunələrində başlıqlar sanki təsəvvür yaratmaq səciyyəsi daşıyır. Məsələn, «Molla Pənah Vaqifin kəlamından Azərbaycanca müxəmməs», «Vidadinin öz arvadını yada salıb ağlaması münasibətilə Vaqiflə deyişməsi», «Vaqif bu qəzəli Vidadinin xahişi ilə yazıb» və s. Bütün bunlar təzkirə üçün xarakterik xüsusiyyət kimi aydınlıqla nəzərə çarpır, M.M.Nəvvabın bilgilərini, təsəvvürlərini ortaya qoyur. Həm də təzkirəçi bu informasiyalarla nümunə haqqında deyimləri, mövcud fikirləri gələcək nəsillərə çatdırır.

Təzkirə üçün maraqlı xüsusiyyətlərdən biri M.M. Nəvvabın qeydlər və əlavələr üçün yer qoymasıdır. Belə ki, Nəvvab haqqında danışdığı şairlərə aid hissənin sonunda ağ vərəqlər saxlamış, ona özünün sonrakı illərdəki əlavələrini, həyatından müxtəlif maraqlı məqamları, eləcə də ölüm tarixini qeyd etməyə çalışmışdır. Bu isə onu göstərir ki, Nəvvab əsəri 1892-ci ildə tam bitirməmiş, sonralar müxtəlif vaxtlarda müəyyən əlavələr etmişdir. Klassik irsin araşdırılması, poeziya və ədəbi nümunələrin təhlili, başqa

ədəbi məclis üzvləri ilə şeirləşmə, bu şeirləşmələrin nəticələrinin təhlili, məclisin gördüyü bu ardıcıl, təmənnasız, milli poeziyaya məhəbbət dolu qayğılı xidmətlər «Təzkireyi-Nəvvab» kimi bir əsərin meydana gəlməsinə səbəb olur» (130, s.4). Müəllif çox haqlı olaraq belə bir toplunun yaranmasının səbəblərini müəyyən-ləşdirməyə, mahiyyətini açmağa çalışır və son olaraq yuxarıdakı kimi maraqlı qənaətə gəlir. Böyük yaradıcılığın, ədəbi mühiti kifayət qədər dərindən bilmənin məntiqi olaraq meydana çıxdığını söyləyir.

Bu kitabda müəllif 158 şairdən danışır və onların şeirlərindən nümunələr verir. Əsər üç hissədən ibarətdir. Hər bir hissə kifayət qədər maraqlı olub fakt zənginliyi ilə diqqəti cəlb edir. Bu hissələrdən öncə Şərq ədəbiyyatı ənənəsinə uyğun olaraq Allahın adını yada salır. Özü də «əvvəlcə əvəzsiz və əbədi olan Allahın adını yada salaq» qənaətində dayanır. Eyni zamanda əlavə edir ki, ağıl onun vəsfini dərk etməz. Bütün bunları dedikdən sonra «Və sonra» bölməsi gəlir. Burada isə müəllif əsərin yazılma səbəblərindən danışır. Nəvvab təzkirəsini ənənəvi olaraq Allahın adı ilə başlayır. Uca yaradandan ruhi qida alaraq, onun şəninə söz qoşur, mədh eləyir və əsərin uğurlu olmasını arzulayır. Sonra yazır ki, «…yad etmək və yadigarlıq üçün Qarabağ şairlərinin qiymətli adlarını və onların həyat tərzi, hərəkətlərini və şeirlərini qeyd edib ruzigarlıq səhifəsində qalması üçün yazdım. Və bu uğurlu məcmuəni «Nəvvabın Təzkirəsi» adlandırıb, əvvəlcə o şairlər ki, vəfat edib və əli bizim zəriflər və ariflər məclisindən üzülüb Allahın rəhmətinə gediblər, onların sözlərindən ixtisarla başladıq» (130, 8).

Birinci hissədə Nəvvab 32 şair haqqında qısa məlumat verməklə bərabər, onların şeirlərindən nümunələri də əsərə

daxil etmişdir. təzkirənin birinci hissəsini müəllif çox çətinliklə yazmışdır. O, qeyd edir ki, bu hissəni çətinliklə olsa da, dünyadan köçənlərin qohum-əqrabalarından öyrənməklə yazmışam. Eyni zamanda yaradıcılıq faktlarını, şairlərin yaradıcılığından nümunələri öz ideya məfkurəsinə uyğun olaraq seçmiş və təzkirəyə daxil etmişdir. Təzkirədə ilk məlumat Molla Pənah Vaqif haqqındadır. Orada «Rəhmətlik Molla Pənah Vaqifin həyat yolu» adlı bir bölmə var. Həmin hissə şairin həyatının bəzi məqamlarını yaşatmaq məqsədinə xidmət edir. Onun anadan olma tarixi, Qarabağ xanlığında xidməti, Ibrahim xanla yaxınlığı, həyatının son çağlarında qarşılaşdığı hadisələr, öldürülmə səhnəsi bir aydınlıqla göstərilir. Bu şeirlərinin rəngarəngliyində də, son dövr yaradıcılığından verdiyi nümunələrdə də görünür.

Təzkirədə ilk şeir nümunəsi M.P.Vaqifin (1717-1797) məşhur «Görmədim» müxəmməsidir. Bu və digər şeirlər bir növ rəngarəngliyi, müxtəlif hadisə və faktları özündə yaşatması, tarixiliyi ilə xüsusi dəyər kəsb edir. Məsələn, şair Kəlimullah Musa haqqında olan qəzəli son dərəcə əhəmiyyətlidir. Həmin nümunə yalnız Musa Kəlimullahın istedadını əks etdirməklə yekunlaşmır, eyni zamanda ədəbi mühiti xarakterizə edir.

Qeyd etdiyimiz kimi əsəri Molla Pənah Vaqifin həyat yolu adlı məlumatla başlayır. Bu heç də təsadüfi deyildir. Belə ki, Qarabağ xanlığının təməl daşlarını düzənlərdən biri M.P.Vaqifdir. O, nəinki, Qarabağ ədəbi mühitinin, hətta Azərbaycan ədəbiyyatının yeni bir dövrünün başlanğıcını qoymuşdur. Bu dövrdə xalq şeiri ilə klassik poeziya bir-biri ilə qaynayıb qarışdı və xalq bu dili Vaqifin poeziya dili adlandırırdı. O, fitri istedad sahibi olmuşdur. M.M.Nəvvab məqsədli şəkildə birinci olaraq M.P.Vaqifin «Görmədim»

müxəmməsini vermişdir. Bu şeirin ön plana çəkilməsi Nəvvab amalını, onun ictimai-siyasi hadisələrə, zəmanəyə münasibətini aydınlaşdırır. Bununla o, püxtələşmiş alim-tədqiqatçı vətəndaş kimi ədəbiyyata, şeirə verdiyi qiymət meyarını açıqlayır. Təzkirədə Vaqifin 19 şeiri və M.V.Vidadi ilə deyişməsi verilmişdir. Bu şeirlərdən «Xristian qızının tərifinə dair» müxəmməs və «Tiflis tərifində dediyi müxəmməsi» diqqəti daha çox cəlb edir. Çünki tarixilik baxımından həmin şeirlər məxəz rolunu oynayır. Belə ki, Qarabağ xanlığının Gürcüstanla, eləcə də qonşu dövlətlərlə əlaqələri şeirlərdə öz əksini tapmışdır. Vaqif Ibrahim xanla Tiflisdə olarkən bu şeirləri yazmışdır. Nümunələr həmin dövrdə iki xalqın mövcud əlaqələrini bir daha təsdiqləyir.

Nəvvabın təzkirədə ikinci məlumat verdiyi şəxs Mirzə Vəli Vidadidir. Nəvvab Mirzə Vəli Vidadini Molla Vəli Vidadi ilə eyniləşdirmişdir. Bu yanlış məlumatı özü də hiss etmiş və belə yazmışdır: «Necə ki, deyirlər və sözlərindən də məlum olur ki, o, sünni olmuşdur. Ancaq onun bütün nəvə-nəticələri və nəsli Qarabağda şiə məzhəbdirlər» (130, 31). Göründüyü kimi, Nəvvabın haqqında danışdığı, nəvə-nəticələrini, nəslini tanıdığı Mirzə Vəli Vidadidir. Belə qənaətə gəlmək olar ki, Nəvvabın Molla Vəli Vidadi haqqında heç bir məlumatı yox imiş. Sadəcə olaraq, o, Molla Vəli Vidadinin şeirlərini şifahi yolla, yaxud da cünglərdən əldə etmişdir. Diqqət etsək Vaqifin Vidadiyə müraciətlə yazdığı «Bax» qəzəlinin «Təzkireyi-Nəvvab»da adı da çəkilməyib. Görünür, Nəvvabın bu şeir haqqında da heç bir məlumatı olmayıb. Çünki təzkirədə ən çox yer verilən nümunələr şairlərin bir-birinə müraciətləri, nəzirələri, deyişmələri, mədhiyyələri və s. bu kimi xarakterli şeirlərdir. Nəvvabın Molla Vəli Vidadi haqqında

heç bir məlumatı olmadığı bir də ondan bəlli olur ki, o, Vidadi ilə Vaqifi bir-birinə düşmən kəsilmiş rəqib kimi təqdim edir. Əslində isə Vidadi Vaqiflə dost olmuş və hətta bu əqidə-məslək dostluğu, yaxın qohumluq əlaqəsi ilə nəticələnmişdir. Bu haqda Qarabağ ədəbi mühitinin görkəmli tədqiqatçısı, mərhum professor N.F.Axundov «Qarabağ salnamələri» kitabında sənədlərin dili ilə çox dəqiq və dərin elmi açıqlama vermişdir. Lakin bu təhriflər böyük zəhmət hesabına ərsəyə çatmış «Təzkirə»nin səviyyəsinə xələl gətirmir.

Daha sonra «Gülablı kəndinin sakini mərhum Kərbəlayi Səfi Valeh» haqqında danışılır. Onu da qeyd edək ki, Kərbəlayi Səfi Valehlə bağlı bölmədə anadan olma və vəfat tarixi ilə bağlı fikirdə təzkirələr arasında fərqlilik var. «Təzkirə»də deyilir: «Qənbər adlı bir şair də onunla müasir olub. Valeh həmin Qənbər və Kərbəlayi Abdulla Canızadə ilə bəzi vaxtlar şeirləşib, bir-birinə həcv deyərdilər. Hər üç şairin həyatı bir-birilə əlaqədar olduğundan biz də qarışıq yazdıq» (130, 35). Göründüyü kimi, bu nümunə M.M.Nəvvabın mühitə kifayət qədər bələdliyini, onlar arasında yaxınlığın olmasını dəqiqliklə bildiyini göstərir. Müxəmməs, müstəzad, tərkibənd, qoşma və s. yazdığını söyləyən müəllif nədənsə heç bir nümunə vermir. Ancaq Abdulla Canızadə və Qənbər Gülablı ilə olan bölmədə Valehin onlarla bağlı olan şeirlərinin təqdiminə üstünlük verir. Bu ardıcıllıqla Qarabağ ədəbi mühitinin XVIII-XIX əsr şairləri haqqında bilgi diqqətəlayiq təsir bağışlayır. Birinci bölmə demək olar XIX əsrin ortalarına qədərki mühiti xarakterizə edir. Onu da qeyd edək ki, birinci hissə Molla Pənah Vaqiflə başlayıb Xudad bəy Əlibəy oğlu ilə yekunlaşır. Ümumilikdə birinci hissə otuz iki şairi əhatə edir. Lakin orada, daha doğrusu, ayrı-ayrı şairlər haqqında

verilən bilgilərdə bir sıra adlar çəkilir ki, bu da digər araşdırmalara şərait yaradır. Birinci hissədə aşağıda adları qeyd olunan şəxslər haqqında məlumat verilir. Mirzə Vəli Vidadi, Bayram xan Baharlı, Gülablı Kərbəlayi Səfi Valeh, Şuşalı Kərbəlayi Abdulla Canı oğlu, Qənbər Gülablı, Yusif Kosa Qarabaği, Mirzə Məriz Mirzə Məhərrəm Hacı oğlu, Mirzə Əli Mirzə Haqverdi oğlu, Qasım bəy Zakir, Mirzə Mehdi bəy Əli Bəy oğlu, Cəfərqulu xan (Arif) Məhəmməd Həsən Ağa Cavanşir oğlu, Bəhmən Mirzə, Mirzə Həsən, Aşıq Pəri, Axund Molla Abbas Cavanşir və s. Bu bölmə eyni zamanda Qarabağ ədəbi mühitindəki inkişafı izləməyə şərait yaradır.

Burada Nəvvab öz babası Mir Faseh haqqında da məlumat verir. O qeyd edir ki, Vaqifin günbəzi ilə mərhum, cənab rəhmətlik Mir Faseh ağanın məqbərəsi arasındakı məsafə 100 zər (107 sm-ə bərabər olan uzunluq ölçüsü) olar. Deyirlər ki, «ağ köynək» olmağı o mərhum bina etmişdir. Onun qəbri nurla dolsun (130, 12). Bütün bunlar və bu kimi məlumatlar təzkirənin birinci hissəsi haqqında təsəvvür yaradır. Müəllifin böyük zəhmətlər bahasına çox böyük iş gördüyünü aşkarlayır. Eyni zamanda bir sıra mübahisəli məqamların dəqiqləşməsinə də şərait yaradır. Məsələn, Q.Zakirlə bağlı olan dəqiqləşməli məqamlar buna nümunədir. F.Köçərli bu məsələlərə xüsusilə diqqət yetirib.

## 3.2. M.M.Nəvvabıın müasirləri haqqında

“Təzkireyi-Nəvvab” əsərinin ikinci hissəsində həyatda olan, yəni Nəvvabın öz dövründə yaşayan şairlər haqqında məlumat və onların şeirlərindən nümunələr verilir. Ikinci hissənin əvvəlində M.M.Nəvvab kifayət qədər dəqiqliklə yazır: «1309-cu ilədək (1892-miladi) sağ olan Qarabağ şairlərinin həyatı barədə və şeirləridir. Allah o incə zövqlü şəxslərin aqibətini xoşbəxt eləsin» (130, 147). Ikinci hissənin bu ilk cümləsi kifayət qədər dəqiq informasiyaya malikdir.

Sonra o birinci hissəyə maraqlı tərzdə yekun vuraraq dövrünün şairlərinin yaradıcılığını yazıya gətirmək məqsədini qeyd edir. «..Sonra Allaha ümid bəsləyən günahkar qul Nəvvab Mir Möhsün Qarabağı bu dünyanı tərk etmiş şairlərin həyat və qiymətli şeirlərini – o şeirləri ki, künclərdə, onun-bunun yanında gizli qalmışdı, bütünlüklə toplayıb, zəmanə ariflərinin və dövran şairlərinin hüzuruna təqdim edib qurtardım. Indi də Allahın köməyi ilə başlayaq sağ qalan şairlərin əhvalını ərz edib qiymətli şeirlərindən elmə və ədəb sahiblərinə söyləməyə. Ümid edirik ki, fəzilət və kamal sahiblərinin xoşuna gələcək» (130, 147). Göründüyü kimi, M.M.Nəvvab birinci hissədə Qarabağ ədəbi mühitinin əvvəlki ustadlarını xatırlayırsa, ikinci hissəni müasirlərinə həsr edir və  dəqiq bilgi verir.

Bundan sonra «Müasir Qarabağ şairləri» başlıqlı bölmə verilir və orada xüsusi olaraq vurğulanır: «Əlavə olaraq aşağıdakı maddələri də aydınlaşdırmaq lazımdır. Çünki gələcək nəsillərə lazım ola bilər»(130, 147). Burada isə dövrün siyasi məsələlərinə Iran, Türkiyə və Rusiya kontekstində aydınlıq gətirilir.

İkinci hissə «Möhtərəmə və möhtəşəmə Natəvan»la başlayır. Onun həyatının müxtəlif məqamları qeyd olunur. Və ilk olaraq Nəvvab Xan qızına yazdığı şeiri verir:

Ehsan banisi, cahanun banusu,
İbrahim xanın gülzarının gül budağı (130, 150).

Bunun ardınca başqa bir xarakterik xüsusiyyətlərlə səciyyələnən informasiya verir: «Xulasə, mətləbdən uzaqlaşmayaq, əhvali və məzacı adi, xarici görünüşü eyibsiz, zərif qadındır. Qadınlara xas olan əməllərdə çox mahirdir. Rəssamlıq sənətində çox qalib və kamildir. Aşağıda qeyd edilmiş şeirlər onun təbinin nəticəsidir» (130, 150).

M.M.Nəvvab şairin doqquz qəzəlini təqdim etmişdir. Hər biri kifayət qədər sənətkarlıq baxımından böyük dəyər kəsb edir. Məsələn, «Əliyyə-Natəvan nuri-didəsi Mir Abbas ağanın vəfatı zamanı demişdir» şeiri başqa bir avtoqrafik vəziyyəti səciyyələndirir. Bir növ onun ağrılarını ifadə edir:

Varımdı sinəmdə dərdü ğəmi-nihan ölürəm,
Fəda olum sənə, gəl, eylə imtahan, ölürəm.
Fəraqdan gecələr yatmazam sabaha kimi,
Xəyali-zülfünə bağlı gedibdi can, ölürəm. (130, 152)

Natəvan yaradıcılığı XIX əsr Qarabağ ədəbi mühitinin zəriflik, gözəllik və ağrılarla dolu bir ürək poeziyasıdır. Bu, M.P.Vaqifin son şeirlərindən Zakirə, ondan da Xurşidbanu Natəvana, hələ bir qədər əvvəl Ağabəyim Ağabacıya ötürülür. Nəhayət, M.M.Nəvvab təzkirəsində «Nə mən olaydım, ilahi, nə də bu aləm olaydı» qənaətində dayanır. Ancaq Xan qızının gördüyü böyük işlər, öz görkəmi kimi Qarabağ ədəbi mühitinə rövnəqlik verirdi. Onun «Məclisi-üns»ə rəhbərlik etməsi, ədəbi mühitlə möhkəm təması buna nümunədi.

Sonra Xurşidbanu Natəvanın oğlu «Knyaz Mehdiqulu Xani-Sani» yaradıcılığı haqqında danışır, şeirlərindən nümunələr verilir. Başlanğıc yazıda maraqlı bir qeyd var: «Bu

əsəri («Vüzüh-əl-ərğam») o cənabın adı ilə başlayıb qurtardım, onun da xoşuna gəldi. Lazımdır ki, risalənin əvvəlində yazılmış bir neçə beyti burada da qeyd edim» (130, 156). Təzkirədə M.M.Nəvvab Knyaz Mehdiqulu xana həsr etdiyi şeiri ilk əvvəl verir:

Ey uca, şərəfli nəsldən olan cavan xan,
Vücudunun səxavətindən cahan cənnət kimidir
(130, 156).

Bütün bunlardan əlavə M.M.Nəvvab onun şeirə, sənətə marağını və verdiyi qiyməti, müasirləri ilə əlaqəni, Vəfa təxəllüsü ilə şeirlər yazdığını da vurğulayır. Eyni zamanda nümunə olaraq dörd şeirini verir. Bütün bunlar onun haqqında təsəvvür yaratmağa xidmət edir. Bunun ardınca kitabda Xurşidbanu Natəvanın digər oğlu Mir Həsən ağa haqqında məlumat verilir, şeiri, sənəti çox sevdiyi vurğulanır. Eyni zamanda onun Xurşidbanu Natəvanın şeirinə yazdığı nəzirə oxuculara təqdim olunur.

Nə zülfi-yarə, ilahi, könül müsəxxər olaydı,
Nə elə zarü pərişan, nə belə müztər olaydı
(130, 160).

Bu şeir sənətkarlıq baxımından mükəmməldir və müəllifinin yaradıcı təbə malik olduğunu aydınlıqla göstərir. Daha sonra Mirzə Fatma Kəminə, Balaca ağa Xan Qaradaği, Səməd bəy Vəlizadə, Bəhram bəy Fədai, Mirzə Növrəs, Məmo bəy Məmayi və başqaları haqqında informativ xarakterli məlumatlar verilir. Həmin məlumatlar bir neçə cümlədən ibarət olub həmin şairlərin həyatlarının əsas məqamlarını yaşatmaq məqsədi daşıyır. Eyni zamanda bu yaradıcı şəxsiyyətlərin daha sonra şeir nümunələri də orada özünə yer tapmışdır.

Beləliklə, təzkirənin ikinci hissəsində Qarabağ ədəbi mühitinin 56 şairinin həyat və yaradıcılığından söhbət açı-

lır, onların əsərlərindən nümunələr verilir. Bunların bir hissəsi «Məclisi-üns»ün nümayəndələridirsə, digər hissəsi «Məclisi-fəramuşan»ın üzvləridir. Bütövlükdə bunlar böyük bir mühiti, onun yaradıcılıq uğurlarını ifadə edir.

Onu da qeyd edək ki, ikincü hissə «Şayiqin tərcümeyi-halı» adlı kiçik bir məlumatla yekunlaşır. Bu hissə təzkirənin ən böyük olan bölməsidir. Burada Mir Möhsün Nəvvabın özü və şeirləri haqqında da geniş məlumat vardır. Bir şair kimi onun yaradıcılıq uğurlarının ədəbi mühitlə bağlılığını daha çox burada öyrənirik.

Üçüncü hissədə kitabın xitaməsi, məzhəkəli şeir parçaları, satiralar, əvvəlki hissələrdə adları getməyən şairlər, Qafqaz şəhərlərinin şairləri haqqında məlumatlar və onların şeirlərindən nümunələr verilir.

Burada maraqlı bir başlanğıc var. Kitabın xitaməsi olan hissədə aydınlaşır ki, Qarabağın vəfat etmiş və həyatda olan şairlərinin öz adlarına müvafiq həcv, satira və s. ənənəsi də olmuşdur. Bu mənada başlanğıc məlumatdan sonra Katib Mirzə Məhəmmədin Xarrat Quluya yazdığı rübai verilir. Onun arxasınca isə Yusifin Katibə cavabı gəlir. Eləcə də Cəfərqulu xanla Növrəsin, Miriş ilə Katibin, Məşədi Əyyub Baki ilə Mirzə Əli Aşiqin mükaliməsi dövrün yaradıcı mühitindəki vəziyyəti, incə yumoru, komizm əhvali-ruhiyyəsini ifadə edir. Bu da özlüyündə ədəbi mühitə əlvanlıq və rəngarənglik gətirir. Burada diqqəti cəlb edəcək maraqlı epizodik hadisələr də var. Məsələn, təzkirədə Miriş ilə Katib arasında olan mükalimə belə xarakterizə olunur: «Mir Möhsün Nəvvab oğlunun on üç yaşı var idi və bir gün mənim mənzilimdə Mirzə Məhəmməd Katib əyləşdiyi vaxt bu Miriş daxil olub Katibə salam verdi.

Miriş: Katib əmi, sənə salam eylərəm,

İzzətini böylə tamam eylərəm.
Katib: Kəsərəm mən o solaxoy əlini,
Bu yazmağı sənə haram eylərəm» (130, 544).

Bütün bunlar üçüncü hissədə dörd səhifədə xarakterizə olunur və mühit haqqında təsəvvürləri dolğunlaşdırmağa xidmət edir. Beləliklə, bu qarşılaşmalar bir tərəfdən xoş xatirə, əhvalat səciyyəsi daşısa da, digər tərəfdən yumoristik məqamların mövcudluğunu da ortaya qoyur. Sonra M.M.Nəvvab «bəzi səbəblər üzündən şeirləri bu təzkirəyə düşməyən şairlərin adları» adlı hissəsini təzkirəyə daxil etmişdir. Bunun ardınca «Bu təzkirə yazılan vaxt həyatda olmayan Qarabağ şairlərinin adları» adı altında on dörd şair haqqında qısa informasiya verilir. Burada Əli ağa, Rafe, Sabit, Mirzə Sadıq, Əsəd bəy, Mehdi və başqalarından söhbət açılır. Məsələn, Mehdi haqqında informasiya bundan ibarətdir: «Qarabağ əhalisindəndir, əhvalı məlum deyil» (130,547). Sonra «Qafqaz şəhərindəki şairlərin həyatda olub-olmamalarından asılı olmayaraq adları, təxəllüsü və olduqları yerin adı» başlığı ilə 21 «Şama şəhərinin, Şirvanın bilik sahibləri»nin adı verilir. Burada ancaq adlar sadalanır. Təkcə Molla Abbasəli Şirvanidən bir qeyd var. Həmin qeyddən aydınlaşır ki, Növrəslə onun arasında həcv yazma olub. Daha sonra Gəncə şəhəri şairlərindən 12, Irəvan şəhəri şairlərindən 6, Ordubad şəhəri şairlərindən 3, Dərbənd şəhər şairlərindən 3, Badikubə şairlərindən 2, Qubadan 1, Lahıcdan 1, Lənkərandan 1 şairin adı çəkilir. Sonda «Qafqaz əhalisindən tanımadığım şairlərin adları» adlı hissə gəlir. Burada dörd şairin adı çəkilir. Bütün bunlar M.M.Nəvvabın böyük işində ərazi spesifikasını aşkarlayır. Eyni zamanda yeni araşdırmaları zəruri edir. Bunlar onu da göstərir ki, «Təzkireyi-Nəvvab» əsəri məhəlləçilik xarakteri daşımayıb,

Qafqazın əksər şəhərlərinin şairləri haqqında məlumatları özündə qoruyub saxlayır.

Burada bir rəngarənglik var və aydınlıqla görünür ki, M.M.Nəvvab bütün olanları təzkirəyə daxil etməmiş, mövzu əlvanlığına da diqqət yetirmişdir. Dövrün ictimai, siyasi, əxlaqi, mənəvi dəyərləri özünə yer almışdır. Sənətkarlar arasında münasibətlər, deyişmə, satira, yumor düşüncəsi kimi məsələlər, dini dəyərlər bir genişliklə görünür. Hətta dindən məqsədləri naminə istifadə edənlər ardıcıl olaraq qamçılanır.

M.M.Nəvvab dini elmlərə bələd olan, onu kifayət qədər bilən şəxsiyyətlərdəndir. Bunu müxtəlif istiqamətli yaradıcılığı, rəsm əsərləri, kitabları da aydınlıqla göstərir. Hətta təzkirədəki şeirlər onun böyük bir din adamı olduğunu deməyə əsas verir. Ona yazılan müraciətlərdə də bu aydınlıqla görünür. Təzkirənin 77-ci səhifəsində «Rəhim bəyin əhvalı»nı bəyan edərkən Nəvvab qeyd edir ki, Rəhim bəy bir gün hamama gəldi və mən də orada idim. Mirzə Qasım Katib adlı mollalardan biri hamamdan çıxıb, libasını geyib, əmmaməsini düzəldirdi. Rəhim bəy mollaya xitabən zarafatla dedi:

Sənin qat-qat olmuş əmmamənə and olsun,
Heç olan fəzlinə və kəmalına and olsun. (130, 77)

Göründüyü kimi yuxarıda verilmiş beyt Nəvvab amalına uyğun gəlməsəydi onu əsərində qeyd etməzdi. O, Rəhim bəyin bir rübaisini və yuxarıdakı beytini əsərində nümunə kimi verməkdən əlavə şeirlərinin itib-batdığını da vurğulayır.

Nəvvab öz dövründə vəfat edən şairlərin ölüm tarixini nəzmə çəkmişdir. Eyni zamanda əbcəd hesabı ilə qeyd edib yaşatmaq yolunu tutmuşdu. Bu da onun vətəndaşlıq xidmətlərindən biri kimi dəyər qazanır. Məsələn, o, «Rəhim bəyin vəfatı və onun tarixi» şeirində yazır:

Elə ki, qürurlu dünyanın qəmlərindən azad oldu,
«Əz fəraq-aməd»dən (1281) ölüm ili əyan oldu.
(130, 77)

Bu isə əbcəd hesabı ilə 1281-ci ilə təsadüf edir ki, miladi tarixinə görə 1863-cü ilə aiddir.

Nəvvab hakim qüvvələrin hökmlərinə və idarə etmək üsullarına qarşı etirazını bu və ya digər şairlərin şeirlərini verməklə də bildirmişdir. Odur ki, «Təzkirə»nin birinci hissəsində verilmiş bəzi şeirlər bu qəbildəndir. Məsələn, M.P.Vaqifin «Görmədim» müxəmməsi, Q.Zakirin ayaqqabılarının Cəfərqulu xanın evində oğurladıqdan sonra onun Bəylər bəyə yazdıqları və s. O, əsərin başlanğıcında dərin rəğbət bəslədiyi və ustad sandığı, klassik nəslə mənsub olan M.P.Vaqifi qələmə aldığı kimi, əsərin ikinci hissəsində ən çox hörmət etdiyi, bütün fəaliyyət dairəsinin pərəstişkarı olduğu X.Natəvan haqqında söz açır.

Nəvvab Natəvandan avtoqraf yazmasını xahiş etmişdi. Lakin təvazökarlıq edən Natəvan cavabı gecikdirmişdi. Nəvvab şeirlə təkrar məktub göndərərək deyir:

Əliyye-aliyyə, ağa cəlilə,
Neçün əşarınız olmaz hüveyda?!

Qəmu əşarlar əncama yetdi,
Sizinkindən əsər olmazmı peyda?! (130, 319)

Daha sonra Nəvvab Natəvan şeirinin gec göndərilməsini obrazlı şəkildə yeni ayın zühur etməsi ilə müqayisə edir. Eləcə də bu gecikməni mülayim və nikbin bir dillə cənnət quşu, yaxud Qafdakı (Qafqaz dağındakı) əfsanəvi simürğlə, kimyagərlərə məxsus iksir və s. ilə təşbeh edir:

Hilali-növ kimi düşmüş xifayə,
Xəti-müşkininiz dönmüş hümayə –
Və ya iksirə, ya kim, kimiyayə

Bilinməz bir əsər manəndi-ünqa. (130, 319)

Nəvvab bütün məqamlarda Natəvan yaradıcılığına dərin hörmət bəsləyən sənətkarlardandı. O, istəyirdi ki, öz təzkirəsində Natəvanın şeirlərini müasiri olduuğu Qarabağ şairlərinin əsərlərinin əvvəlində versin:

Mənim qəsdim budur banuyi-əzəm,
Sizin əşarınız olsun müqəddəm.
Bu namə nami olsun həm mükərrəm,
Və gər nə, rövnəq olmaz bunda əsla. (130, 319)

Nəvvabın Natəvana qarşı həssalığı və qayğıkeşliyi ona uzun və şərəfli həyat arzulaması kimi səmimi hissləri də bu şeirdə öz əksini tapmışdır. Nəvvab elm, mədəniyyət, quruculuq yolunda var qüvvəsini əsirgəməyən Natəvana eyni arzularla yaşayan şairin ürək sözlərini bildirir:

Kəlamınız gərək sərdəftər olsun,
Cəvahir nəzminizdən əşhər olsun.
Kütüb təzyinə düşsün, ənvər olsun,
Necə xurşidi-ənvərdən bu dünya. (130, 320)

Misralardan anlaşıldığı kimi Nəvvab Natəvana istedadlı, öz adı kimi işıqlı şeirlər göndərməyi arzulayır. Gərək təzkirədəki Natəvan şeirləri müəllifi kimi dürr, gövhər kimi təkrarsız olsun. Təzkirədə Nəvvab X.Natəvanı belə təqdim edir: «Çox möhtərəm, alimənsəb Xurşidbanu Bəyim cənab Mehdi xan ibn Ibrahim Xəlil xanın qızıdır. Şuşa şəhərində anadan olmuşdur:

Parlasın onun camalının günəşi,
Afiyət bürcündən hər ay və hər il?

Və təxəllüsü Natəvan idi. Əba və əcdadı kimi o da həmişə səxavət və ətaət mənbəyi olub ehsan üçün tikinti aparmış, 1291-ci ildə (miladi tarixi ilə 1874) şəhər əhalisi üçün çox xərc ilə şəhərin şimalından şəhərə çox yaxşı bir su

çəkdirdi. O, suyun anbarı üçün uca, möhkəm və ali bir bina tikdirdi.

Şəhər əhalisinin gəzintisi üçün fərəh artıran, cənnətməkan bir gülzar bağ saldırmışdı…

Nəhayət, Natəvan etedal məzaclı, düz qamətli bir qadın idi. nəqqaşlıq elmində mahir və şeirdə kamil idi. Şeirləri pərakəndədir və divanı yoxdur» (130, 149).

Daha sonra Nəvvab Natəvanın on iki qəzəlini təzkirəyə daxil etmişdir.

Nəvvab Qarabağ şairləri ilə geniş yaradıcılıq əlaqəsinə malik olmuşdur. Belə şairlərdən biri də Fatma xanım Kəminədir. Nəvvabın təzkirəsində Natəvandan sonra bəyan etdiyi şairədir. Fatma xanım Bəybaba qızı Tahirzadə Kəminə 1841-ci ildə Şuşa şəhərində anadan olmuşdur. Kəminənin atası Bəybaba da Fəna təxəllüsü ilə şeirlər yazmış, vaxtilə Ibrahim xanın oğlu Məhəmməd Həsən ağanın sarayında mirzəlik etmişdir.

Fatma xanım Kəminə 1898-ci ildə Şuşada vəfat etmişdir. Onun divanından az bir hissə bizə gəlib çatmışdır.

M.M.Nəvvabın təzkirəsində Kəminə haqqında xeyli maraqlı məlumata rast gəlirik. Məlum olur ki, Fatma xanım Kəminə Azərbaycan və fars dillərində yazmış, Qarabağ şairləri arasında yüksək nüfuza malik olmuşdur. O, Nəvvaba dərin hörmət bəsləmişdir. Nəvvabın «Aşiq oldum nagahan bir şuxi-bipərvayə mən» misrası ilə başlayan qəzəlinə Fatma xanım Kəminə aşağıdakı misralar ilə başlayan cavabı yazmışdır:

Eşqdə sud etmədim, düşdüm dəxi sevdayə mən,
Tapmadım bir sud, oldum böylə bisərmayə mən!
(130, 300)

Həmin cavab-bənzətmədə onunla həmdərd olan Nəvvaba və «Məclisi-fəramuşan»ın hörmətli üzvləri Həsənəli

xan Qaradağiyə, Mirzə Ələsgər Növrəsə, Məşədi Əyyub Bakiyə, Abış bəyə öz ürək çırpıntılarını çatdırır:

Xaki-kuyi-dərgəhi-Nəvvab olaydım kaş ki,
Bulmuşam bəxtimi, yetməm rütbeyi-əlayə mən.
Abışa, bilmiş Qaradaği Kəminə dağlanıb,
Olalı sərkar Növrəs, Bakiyə həmsayə mən!

(130, 301)

Nəvvabın və Kəminənin eyni mətləli qəzəllərinə Abış və Baki də bənzətmə-nəzirə yazmışlar. Nəvvab təzkirəsini yazan zaman məclisin bütün üzvlərinə, o cümlədən Fatma xanım Kəminəyə də müraciət etmiş, öz dəst-xətti ilə həyatı barədə məlumat verməyi və bir neçə şeirini təzkirəyə daxil etmək üçün göndərməsini israr etmişdir. Nəvvabın məktubu Fatma xanım Kəminəyə xoş təsir bağışlamışdır. O, yazmışdır:

Bu gün iqbalü bəxtimdə gümanım çox mətin olmuş,
Ki, Nəvvabın mənə əltafı sidqlə yəqin olmuş.
Nəvaziş eyləyib kər bürdəni, bu xülqi-əhsandır,
Nəcibü əsl olan kəsdə bu surətlər mübin olmuş.
Çəkibdir rüşteyi-nəzmə Nizami kimi əlfazi,
Baxanda lütf ilə hər biri bir dürri-səmin olmuş.
Təfaxir eylərəm kim, qabili-dəftər olub şeirim,
Mənim də yazdığım sözlər ki, əşara qərin olmuş…

(130, 272)

Fatma xanım Kəminənin şeirindəki poetikliyin, dəyərlərin nəticəsi idi ki, Nəvvab onun şeirlərini bəyənmiş və öz təzkirəsinə daxil etməyə çalışmışdır. Nəvvabın özü də Fatma xanım Kəminəyə şeirlərini göndərdiyi üçün səmimi bir şeir yazıb ona çatdırmışdır. Bu şeirdə Nəvvab Kəminənin yaradıcılığını «Cəvahir nəzm» adlandırmışdır.

Kəminə, nəzmü əşarın yetişdi, şadman oldum,
Cəvahir nəzmdir, vəh-vəh və ya dürdür səmin olmuş.

Gözəl əşardır məzmunları həm şerdən nazik,
Bəyani çox mübəyyəndir, məzamini mətin olmuş.
Nə xoş mənzumədir, göyçək, qəmu mənası müstəhsən,
Nəbatü qəndü şəhd ilə məgər yeksər əcin olmuş?
Əcəb lölöi-qəltandır çəkilmiş rişteyi-nəzmə,
Şəkərləbdən biruz etmiş ki, böylə şəkkərin olmuş.
Yəqin bil, övci əlayə dayandı nücmi-iqbalın,
Belə daim kitab içrə ki, əqvalın qərin olmuş.
Riza Nəvvabdır səndən həmə övqatü hər saət,
Xəyali gər pərişandır, sizə leykən müin olmuş
(130, 272).

Nəvvab təzkirədə Fatma xanım Kəminənin doqquz qəzəlini vermişdir.

Daha sonra Nəvvab özü haqqında danışanda Kəminənin də bir neçə şeirini təqdim etmişdir.

Nəvvab təzkirədə bəyan etdiyi şairlərin bədii portretini sözlə elə ifadə etmişdir ki, hər bir oxucunun gözləri qarşısında həmin adamın şəkli canlanır, haqqında müəyyən təsəvvür oyanır. Məsələn, Q.Zakir haqqında Nəvvab belə yazır: «Xoş üzlü, ağ əndamlı, uca boylu, arıq, göy gözlü bir kişi idi» (130, 49). Və yaxud da Cəfərqulu xan Nəva haqqında belə bir xatırlama verir: «O, şücaətli, uca qamətli, güclü və zahiri görünüşündən məlum olduğu kimi qüvvətli bir şəxs idi» (130,60). Q.Zakir isə Cəfərqulu xan Nəvvaya «Yekəpər» deyə şeirlərində müraciət edir. Göründüyü kimi, Nəvvab reallığın əksini təkcə sulu boya ilə deyil, sözlə də yığcam, aydın və səlis şəkildə ifadə etmək bacarığına malik olmuşdur. Bu xüsusiyyət onun rəssamlıq, nəqqaşlıq sahəsində əldə etdiyi uğurlardan irəli gəlirdi. Demək, Nəvvab təbliğatçı, təşkilatçı olmaqla bərabər, həm də öz dövrünün aynası olmuşdur. Bir məsələni də qeyd edək ki, o, soy kökünə bağlı, dini, əqidəsi düzgün formalaşan bir

şəxsiyyət kimi xalqımızın tarixi keçimşini əsərlərində əks etdirən böyük sənətkardır.

Təzkirədə ən çox müəlliflərin bir-birinə cavab xarakterli mövzularda şeirləri özünə yer alır. Əhvalatlarla, məişətlə bağlı şeirlər daha çoxdur. Bununla yanaşı, onlar müraciəti, adi bir məktubu da nəzm şəklində yazmışlar. Bu cəhətdən Cəfərqulu xan və Aşıq Pəri (Maralyanlı), Məhəmməd bəy Zəngilani və Mirzə Həsən, Mirzə Həsən və Aşıq Pəri, Aşıq Pəri və Mirzəcan Mədətov, Məhəmməd bəy Zəngilani və Aşıq Pəri və s. arasında qarşılıqlı yazışmalar diqqəti cəlb edir. Bu məktublaşma adi görünsə də, dövrün ab-havasından, ictimai quruluşdan irəli gələn haldır.

Təzkirədə eşq sərkərdələri olan şairlər hərbə-zorba ilə şeirin kifayət qədər poetik nümunələri ilə səciyyələnirlər. Bununla da bir-birinin formalaşmasına zəmin hazırlayır və ədəbi əlaqələri genişləndirirlər. Bu, təzkirədə bir ənənə təsiri bağışlayır. M.P.Vaqifdən, M.V.Vidadidən ta bu təzkirənin müəllifinə qədər davamlı olaraq nəzərə çarpır. Bunlar eyni zamanda deyişmə kimi xalq düşüncəsinin qədimliyi ilə bağlanma ətrafında düşünməni də zəruri edir. Onu da qeyd edək ki, burada müxtəlif fikirlərin bölüşməsi, hadisəyə münasibətin öyrənilməsi halı da var. Burada müəyyən təqiblərə məruz qalma halları da görünür. M.M.Nəvvab təzkirəsi bu mənada özündə çox mətləbləri ehtiva edir. Mühit haqqında bütün təsəvvür yaratmaq amalına yüklənir. Təzkirədə Mir Möhsün Nəvvabın həyatı, insanlara və bütövlükdə mühitə seyrçi deyil, məntiqi fikrə əsaslanan fəal münasibəti və müasirlərinin Nəvvaba yazdıqları cavabları, o dövrü aydınlıqla əks etdirmişdir. Mirzə Həsən Kaşifiyə görə, bütün aləmin icadına bais eşqdir. Hətta eşq Allahın böyüklük xəzinəsinin açarı hesab olunur. Şair «Mirzə Həsən Kaşifin Nəvvabın eşq haqqında

olan sualına cavabı» şeirində eşq haqqında belə söyləmişdir:

Eşq dünyanın icadının bayisi oldu.
Eşq Vəfa əhlinin ürəyinin meracıdır,
Eşq ululların xəzinəsinin açarıdır,
Eşq binəvaların yol göstərənidir,
Eşq aşiqlərin Cəbrayılıdır.
Eşq qaranlıq gecələri işıqlandırandır,
Eşq vəfa əhlinin ürək güzgüsüdür. (130,282).

Burada şair ilahi eşq fəlsəfəsini təlqin etməklə bərabər, böyük klassik və dahi Nizami Gəncəvi kimi bütün varlığı eşqin məhsulu sanmışdır. Həmçinin Həsən Kaşifi M.M.Nəvvaba müraciət etmiş və ondan «mahiyyətin əsl məzmunu» haqqında şərh verməsini istəmişdir. «Mahiyyətin necəliyi haqqında Mir Möhsünün Həsən Kaşifiyə cavabı» şeirində Nəvvab fəlsəfi düşüncələrini belə izah etmişdir ki, hiss olunan hər bir şeyin mahiyyəti vardır. O, şey ki, hiss olunandı, onun surəti də mövcuddur. Mahiyyət və surət bir-birindən ayrılmaz varlıqlardır:

Dünyada olan hər bir şeyin surəti vardır,
Və hər surətin də bir mahiyyəti vardır....
Mahiyyət keyfiyyətin içində,
Dəmirdə qızılın olduğu kimidir...
Bu kateqoriyalar ayrılıqda ola bilməz,
Onlar biri-birinə möhtacdırlar.(130, 284).

Göründyü kimi, şairin dünyaya baxışına, həyatı duyumuna uyğun öz fəlsəfəsi vardır. «Təzkireyi-Nəvvab» XIX əsrdə yaranmış başqa təzkirələr kimi bəzi detalların dəqiqləşdirilməsində, klassik poeziyanın inkişaf xəttinin izlənməsində əvəzsiz mənbə rolunu oynayır.

«Təzkireyi-Nəvvab» əsəri 1998-ci ildə Vasif Quliyevin redaktorluğu ilə «Azərbaycan» nəşriyyatı tərəfindən nəfis şəkildə nəşr edilmişdir. Əsər klassik irsimizin öyrənilməsində mühüm əhəmiyyət kəsb edən mənbələrdəndir. Dediyimiz kimi, bu əsər üç hissədən ibarətdir. Orada yüz əlli səkkiz qələm əhlindən bu və ya digər dərəcədə məlumatla yanaşı, şeirlərindən nümunələr də verilmişdir. Klassik irsə bağlılıq və ondan yaradıcı şəkildə istifadə M.M.Nəvvab yaradıcılığının əsasını təşkil edir. Odur ki, «Təzkireyi-Nəvvab» əsərinin Allahın adı ilə başlanması da klassik bir üslubdur. Həmçinin «Dinə rəxnə salan şəxslərin tənbihi haqqında Nəvvabın sözü»ndə verilmiş nəzm parçası «Kitabi-Dədə Qorqud» dastanını xatırladır:

Xətlan atı tənbəllik edərsə
Qoduq belə atdan yaxşı.
Hər övlad ataya müti olmasa,
O, övlad deyil, başı batsa yaxşı
Tamahkarlığa bağlı olan hər kəsdən,
Bazar iti yüz dəfə yaxşı (130, 9).

«Kitabi-Dədə Qorqud» dastanının müqəddiməsində isə belə yazılıb:

Qonağı gəlməyən qara evlər yıxılsa yey,
At yeməyən acı otlar (bitincə), bitməsə yey.
Adam içməz acı sular sızınca, sızmasa yey…
(74, 12)

Bu üslub yaxınlığı klassik ənənənin davamlığını söyləməyə əsas verir. Eyni zamanda Qarabağ ədəbi mühitində onun yaşandığını ifadə edir. Qarabağ ədəbi mühitində klassik irsdən bəhrələnmək və bu irsi güclü surətdə təbliğ, təqlid etməkdən əlavə, müasir həyat mövzusu, yaşadığı

aləmi dərk etmək, çatışmazlıqlara qarşı barışmaz olmaq ideyası o dövrün ədəbi prosesində başlıca dəyər kəsb edirdi.

XIX əsrdə Qarabağ ədəbi mühitində maarifçilik, vətənpərvərlik, beynəlmiləlçilik, millilik, Avropa mədəniy-yətinə meyl bir daha bu regionun zamanıın ahəngi ilə səsləşdiyini, demokratik mövqedə durumuna əyani sübut-dur. Müsbət cəhət odur ki, bu dövrdə yaranan ədəbi nümunələr mühafizəkarlıqdan, fərdiyyəçilikdən kənar olub xalq mənafeyinə xidmət edən, xalqın arzu və istəklərinə cavab verən ümumxalq ideyaları ilə silahlanmış milli ruhlu ədəbi nümunələr idi.

M.M.Nəvvab «Təzkireyi-Nəvvab» əsərini çətin bir dövrdə, cəhalətin hökm sürdüyü bir zamanda başlamış və onu uğurla sona çatdırmışdır.

M.M.Nəvvab təzkirədə Abbas adlı bir nəfərin «Gör-müşəm» qoşmasını təqdim etmiş, lakin onun kimliyi haq-qında heç bir məlumat verməmişdir. Həmin şeirdən sonra müəllifi göstərilməmiş «Eyləmə» qoşması verilmişdir. Hər iki qoşmanı diqqətlə oxuduqda eyni müəllifə aid olduğunu deyim, duyum, ifadə tərzi, üslubu da aydınlıqla göstərir.

Qoynun içi qızıl gülün çəməni,
Dişin dürdür, dodaqların Yəməni.
Cənnət camalından ayırma məni,
Səndən ayrılalı dami görmüşəm (130, 140).

Müəllifi göstərilməyən «Eyləmə» qoşmasının ikinci bəndində isə yazılıb:

Qoynun içi qızıl gülün çəməni,
Dodaqların ləl, mərcan Yəməni,
Aşiqinəm hər dəm yada sal məni,
Vəfalı yar, bivəfalıq eyləmə (130, 140).

Göründüyü kimi, burada deyim və duyum tərzinin eyniyyəti var. Demək, «Eyləmə» qoşmasını da Abbas yaz-

mışdır. Bəs onda, Abbas kimdir? Araşdırmalar göstərir ki, bədahətən şeirlər söyləyən, duzlu, məzəli söhbətləri ilə bu gün də xalqımızın yaddaşında yaşayan Abbas Laçın rayonunun Piçənis kənd sakini olmuşdur. O, Aşıq Abbas deyə çağrılarmış. Aşıq Abbas Paşa bəyin yaxın dostu, məsləhət verəni olmuş, hazırcavablığı ilə həmişə diqqəti cəlb etmişdir. Sanki Paşa bəy sarayının şairi olmuşdur. Onun xalq arasında bu gün də duzlu-məzəli söhbətləri söylənir. O, yaşının ahıl çağında Paşa bəyin oğlu Sultan bəylə də həmfikir olmuş və onun mirzəsi işləmişdir. Erməni daşnakları ilə mübarizədə Aşıq Abbas elin igid ərlərini mədh etmiş, onları sazı və sözü ilə mübarizəyə ruhlandırmışdır:

Çağırın igidlər girsin meydana,
Gavırın başını batırsın qana,
Dağlar arxa dursun böyük Sultana
Düşmənin başını əzəcəyik biz,
Ulğumun bədəndən üzəcəyik biz.

Xalq arasında belə bir fikir dolaşmaqdadır ki, Aşıq Abbas Şuşaya tez-tez gəlmiş və hətta Xan qızı Natəvanın şəxsi qonağı olmuşdur. Onu da qeyd edək ki, Qarabağ ədəbi mühitinin şairləri, eləcə də Xan qızı Natəvan bədahətən deyilən şeirdən ləzzət alarmış. Aşıq Abbas da söylənilənlərə görə həmişə şeiri bədahətən deyərmiş. Natəvan bir dəfə xəbər göndərib Aşıq Abbası xüsusi dəvətlə Şuşaya çağırmışdır. «Eyləmə» qoşmasının sonuncu bəndi də imkan verir deyək ki, Aşıq Abbas hər iki qoşmasını Natəvanın tərifinə həsr etmişdir:

Hüsnün düşüb Dağıstana, Dərbəndə
Dodaqların bənzər nabata, qəndə,
Bir busə lütf eylə mən dərdiməndə,

Ağrın alım nakəsalıq eyləmə. (130,140).

Burada Natəvanın Dağıstanla, Xasay xan Ismiyevlə bağlılığına işarə edilib.

XVIII-XIX əsrdə Qarabağ ədəbi mühitində maraq doğuran istiqamətlərdən biri nəziréçilik ənənəsidir. Bu dövrdə nəzirə yazmaq geniş vüsət almışdır. Burada diqqəti cəlb edən başlıca cəhət nəzirə yazılan əsərin həm sənətkarlıq, həm də mövzu və ideya baxımından tam dolğun, məqsədəuyğun olmasındadır. Eyni zamanda dövrün tələblərinə cavab verməə də var. Bu da imkan verir deyək ki, nəzirəçilik gözəl zəmin üzərində qurulmuş və ədəbiyyatımızın inkişafına səbəb olmuşdur.

«Nəzirə – hər hansı müəllifin bu və ya başqa əsərinin təsiri, ona bənzətmə yolu ilə yaradılan əsərdir. Nəzirə orijinala həm mövzu və süjet, həm də formaca yaxın ola bilər. Nəzirənin ideya bədii səciyyəsi müəllifin istedadından asılıdır. Məsələn, Əmir Xosrov Dəhləvi, Nəvai, Cami və Füzulinin Nizami Gəncəvi «Xəmsə»si mövzularında yazdıqları poemalar orijinal ideya məzmununa və bədii xüsusiyyətlərə malik müstəqil sənət əsərləridir. Bəzən şairlər poetik yarış məqsədi ilə məşhur bir şeirə də nəzirə yazmışlar. Bədii yaradıcılığa yenilik gətirməyən nəzirəçilərə təqlidçi deyilir». (22, 223). Bu misallardan da aydın olur ki, nəzirə yazılan əsər güclü, dolğun və məqsədəuyğun olmalıdır. Odur ki, nəzirəçilik klassik ədəbiyyatın seçmə nümunələri əsasında yazılırmış. Bu seçmə nümunələr Nizami Gəncəvi, M.Füzuli, M.P.Vaqif və s. bu kimi klassiklərin yaradıcılığından süzülüb gəlir. Yuxarıda verilən nümunələr bir daha aşkarlayır ki, nəzirə sənətkarlıq baxımından qüsurlu olan əsərlərə yazılmır. XIX əsrdə yaşayıb yaradan sənətkarların əsərlərinə yazılmış nəzirələr də bunu bir daha təsdiqləyir. Yüksək sənət nümunələri XIX

əsrdə də yaranmışdır. Bu dövrdə poetik yarış məqsədi ilə nəzirə yazan təqlidçilər də vardır. Lakin nəzirəçilik ədəbi məktəbini davam etdirən, klassik səviyyədə əsərlər yaradan X.Natəvan, F.Kəminə, M.Ə.Baki, A.Asi, M.M.Nəvvab və b. şairlər onlarladır. Şuşada təşkil olunmuş hər iki məclis üzvlərinin həm öz aralarında, həm də Şamaxıdakı «Beytüs-səfa» məclisi ilə qızğın şeirləşmələri olmuşdur. Professor N.F.Axundov yazırdı ki, «Beytuş-səfa» üzvlərinin Füzuliyə yazdıqları nəzirələrin keyfiyyətini müəyyən etmək və hansı şeirin daha üstün olmasını göstərmək üçün «Məclisi-fəramuşan»ın mühakiməsinə verilir və ondan bir növ arbitr kimi istifadə olunurdu. Bütün bunlar nəticə etibarilə Qarabağ ədəbi mühitindəki zənginliyi, istiqamət müxtəlifliyini özündə ehtiva edir. Nəzirə ənənəsi də bura daxildir. M.M.Nəvvab təzkirəsində də bu bir istiqamət kimi özünə yer tapır. Burada eyni zamanda mühit anlamında əlaqələrdə də özünəməxsusluqlar vardır. Beləliklə, Qarabağ ədəbi mühiti bu rəngarəngliklərlə, ənənə ilə, özünəməx-susluğun qovuşuğunda görünür.

Ümumiyyətlə, «Təzkireyi-Nəvvab» hələ çox şairlərin qaranlıq məqamlarının açarı və Qarabağ ədəbi mühitinin xəzinəsidir. Bu mənada təzkirənin dəyəri sonsuzluqla ölçülür. Ədəbi mühitin ümumi mənzərəsini aşkarlamağa, ayrı-ayrı fakt və hadisələri dəqiqləşdirməyə əsas verir. Eyni zamanda üslub rəngarəngliyini, klassik üslubla xalq şeiri ruhunda şeir yazmasının böyük inkişaf yolunda olduğunu aşkarlayır. Yeni-yeni araşdırmalara ehtiyac doğurur. Bu gün isə siyasi hadisələrin kəskinləşdiyi, o torpaqların düşmən tapdağında olduğu zamanda həmin faktların araşdırılması, mühitin öyrənilməsi daha aktuallıq kəsb edir. Bunu indiyə qədər dediklərimiz bir daha təsdiqləyir. Mühitin hansı ideallarla yaşadığını göstərir.

## 3.3. M.M.Nəvvabın lirikası

M.M.Nəvvab Azərbaycan ədəbi-nəzəri fikrində müxtəlif istiqamətli, kifayət qədər zəngin olan böyük işlər görmüşdu. Bu sırada diqqəti cəlb edən istiqamətlərdən biri də onun lirikasıdı. M.M.Nəvvab Qarabağ ədəbi mühitində təkcə təzkirəçi, ədəbiyyatşünas, «Məclisi-fəramüşan»ın (137) rəhbəri kimi deyil, eyni zamanda müxtəlif səpkili lirik şeirləri ilə tanınmışdır. Onun lirikasına ayrı-ayrı tədqiqatçılar öz əsərlərində diqqət yetirmiş, ona qiymət verməyə çalışmışlar. Ancaq şairin lirik şeirlərinin ədəbi mühit kontekstində tədqiq etmək, poeziyasının mövzu və ideya istiqamətlərini ortaya qoymaq zərurəti yaranır. Bu Qarabağ ədəbi mühitinin özünün də bir sıra cəhətlərini ortaya çıxarmaq deməkdir. Belə ki, Mir Möhsün Nəvvabın şeirlərinin böyük bir qismi ünvanlıdı və mühitin ayrı-ayrı adamlarına müraciətlə yazılmışdır. Burada isə dövrün hadisələrinə, bir çox ictimai - siyasi məsələlərinə münasibət, fikrin bölüşməsi var. Belə bir xətt ilk növbədə Qarabağ ədəbi mühitindəki ənənə ilə bağlıdır. M.P.Vaqifdən, Abdulla Canıoğludan, Kərbəlayi Səfi Valehdən, C.Nəvadan, M.Aşiqdən, Mirzə Həsəndən, Aşıq Pəridən gələn ənənədir ki, Mir Möhsün Nəvvabda da yaşanır. Bütövlükdə M.M.Nəvvab yaradıcılığında bir sıra xarakterik xüsusiyyətlər var ki, bunlar Qarabağ ədəbi mühiti üçün də səciyyəvidir. Onlardan biri M.M.Nəvvabın müraciətləridir ki, həmin müraciətlərin bir qismini o, öz təzkirəsində vermişdir. Məsələn, «Səfalı «Məclisi-ünsün» ağsaqqallarının suallarına Nəvvabın cavabı»(130,276), «Nəvvabın «Məhfəli-ünsün həmməclislərinə həqiqət haqqında sualı»(130,277), «Məclisi-üns»ün üzvü Mirzə Həsənin cavabı»(130,277),, «Nəvvabın «Məclisi-üns»

üzvlərinə ikinci sualı»(130,289),, «Mahiyyətin necəliyi haqqında Mir Möhsünün Həsən Kaşifiyə cavabı»(130,283) və s. başlıqlarda olan poetik yazışmalarını göstərmək olar.

Onu da qeyd edək ki, ərəb, fars və Azərbaycan dilində yazıb yaradan bu ensiklopedik şəxsin təzkirədə verdiyi şeirlərinin bir hissəsi ana dilindədir və həmin nümunələr ədəbi mühitin bir sıra tərəflərini öyrənmək üçün gərəklidir. Yaradıcı şəxslərin «Məclisi-üns»də, «Məclisi-fəramuşan»da yaradıcılıq söhbətlərinin nələr üzərində qurulduğu daha çox burada müəyyənləşir. Məhz bu problemlər Mir Möhsün Nəvvabın ünvanladığı suallarda, ona verilən cavablarda aydınlıqla görünür. Məsələn, Mir Möhsün Nəvvabın «Məclisi-üns»ün üzvlərinə ünvanladığı «İkinci sual» adlı bir şeiri var. Burada müxtəlif məsələlərdən, eləcə də nəyə görə «Beytüs-səfa»nın bağlanmasından söhbət açır:

Ey əzizlərim, ey ürəfa əhli,
Ey tərif edənlər, ey həqiqət söyləyənlər.
Nəyə görə «Beytüs-səfa» bağlandı,
Nə səbəbə vəfa məclisimiz bağlandı?
Məgər hikmət gülşəni taracmı oldu?
Və ya sinələr qəm oxuna hədəfmi oldu?! (130, 280)

Göründüyü kimi, bu şeir özlüyündə tarixi bir olayı ifadə edir və «Beytüs-səfa»nın bağlanması haqqında informasiya verir. Ən başlıcası, burada müəyyən bir təəssüf hissi aydınlıqla özünün ifadəsini tapır. Eyni zamanda bu mühitin ayrı-ayrı nümayəndələri ilə bağlı konkret informasiya vermə keyfiyyəti də açıq-aydın görünməkdədir. Məsələn, Növrəs, Həsən, Kaşefi, Agəh, Məxfi və s. haqqında deyilənlər ciddi bir qiymətləndirmədir:

Ey şeirləri tərifə layiq olan Həsən,
Afərin sənin gövhər nəzminə! (130, 280)

Bütün bunlar bir tərəfdən M.M.Nəvvabın ədəbi mühitlərə bələdliyini, eyni zamanda oradakı yazarlarla münasibətlərini aşkarlayır. Başqa tərəfdən ədibin ədəbi-estetik görüşlərini əks etdirir. Üçüncü tərəfdən şairin ədəbi mühiti qiymətləndirməsi təsiri bağışlayır. Çünki mühitlər arasında o dövrdə bir mədəni əlaqə hökm sürməkdə idi. Onlar bir növ bu əlaqələrlə ictimai, siyasi mühitdə baş verənlərə özlərinin münasibətlərini bildirirdilər.

Təzkirədə maraq doğuran məqamlardan biri Mir Möhsün Nəvvaba yönələn suallara cavabdır. Bu cavablar özünün dərinliyi və mükəmməlliyi ilə seçilir. Şairin hansı ideallarla yaşamasını aşkarlayır. Məsələn, «Şəfalı «Məclisi-üns»ün ağsaqqallarının suallarına Nəvvabın cavabı»nda bir sıra maraqlı məqamlar, şairin müqəddəs kitabımız «Quran»a dərindən bələdliyi, orada yalanın və ziyanın pislənməsi və s. hallar özünün əksini tapır:

Sizin suallara bir nəzər saldım,
Həm də müxtəsər cavab yazdım.
Ey ki, sordun nədir dünyada yalan,
Onun mənası gizli qalmaz,
Onunçün Quran belə buyurmuşdur:
Tanrı yalançıları sevmir (130, 278).

«Avesta»da da yalan ən pis xüsusiyyət kimi vurğulanır. «Yalanlarla, riyalarla məni təngə gətirdiniz» qənaəti məhz əski düşüncədən, xalq yaradıcılığından keçərək günümüzə qədər ədəbiyyatı izləməkdədir və maraqlıdır ki, M.M.Nəvvabda da yaşanır.

Eyni zamanda M.M.Nəvvabın «Məclisi-üns»ə ünvanladığı suallar da var. Bunlardan biri həqiqət haqqındadır. “Təzkirə”də «Nəvvabın «Məhfəli-üns»ün həmməclislərinə həqiqət haqqında sualı» başlığı ilə verilmişdir:

Ey əzizlər, dərdinə dərman edin,

Can yaralarına məlhəm qoyun.
Həqiqət nədir bu dünyada,
Ki, xalqın dilində bu qədər şöhrət tapıbdır?

Sonluqda maraqlı olacaq bir tərzdə vurğulanır:

Sizə bu xitab əyan olduğu üçün,
Tez gərək göndərilə cavab. (130, 277)

Bu suallar mühitin hansı düşüncəyə kökləndiyini, onların hansı duyğularla yaşadığını aydınlıqla göstərir. Bir növ bu sorğu-suallar başqa istiqamətdə düşüncənin sınağı kimi aşıq deyişmələrini xatırladır. Aşıq deyişmələrində də ustad olanın sınağı, hansı səviyyəyə sahib olması faktı var. Ancaq bu suallarda mühitin insan, zaman, dünya haqqında düşüncələri şair düşüncəsinin süzgəcindən keçir. Bu sırada «Məclisi-üns»ün üzvü Mirzə Həsənin cavabı nəqşbəndilik, təriqət düşüncələri fonunda səciyyələnir:

Kamil insanlar məcaz işlərdə də,
Açıq gözlərlə həqiqətə baxmışlar.
Dünyada nəqşlər görsələr də,
Onlar hamısı nəqşbəndilik istərlər (130, 278.).

Mir Möhsün Nəvvabın sualına bir neçə sənətkar bir-birindən fərqli cavablar vermişlər. Onların sırasında maraq doğuranlardan biri Agəhin cavabıdır. Bu cavabların hər biri özünün dolğunluğu, müqəddəs ideallara xidmət etməsi ilə mühüm dəyər kəsb edir. Daha doğrusu mühitin siyasi izdivaclarında həqiqət axtarışı təsiri bağışlayır. Məsələyə bu kontekstdən yanaşdıqda sualın qoyuluşu kifayət qədər ağır görünür. Bu cavablarda da aydın nəzərə çarpır. Ağəh cavabında deyir:

Nəfs və hiss həqiqətdir,
Bu isə ünsürün qəlbində var idi.
Nəfsdəki işıq Allahın feyzindəndir,
Bu, Allahın mərhəmət xəzinəsindən bir gövhərdir

(130, 279).

Bütün bu nümunələrdə müəyyən bir fəlsəfi düşüncə özünə yer alır və eyni zamanda ədəbi prosesin çəkisini nümayiş etdirir. Qarabağ ədəbi mühiti, eləcə də Nəvvab dini və dünyəvi zənginlikdə görünür. Böyük zəka sahibi, qüdrətli şair kimi qarşılıqlı yarışmalarda daha çox açılır. Eyni zamanda ayrı-ayrı sənətkarlar ona ünvanladığı şeirlərində ali-əbanın yetirməsi, Mustafa bağının qönçəsi» və s. kimi qiymətləndirir. «Məclisi-üns»ün üzvü Mirzə Həsənin cavabı» bu baxımdan əhatəliliyi və dəqiqliyi ilə xüsusi maraq doğurur:

Ey Möhsün, ey ehsan və bəxşişin əmiri,
Ey vücudu səxavət və kəramət təcəssümü.
Ey Möhsün, ey fəzilətli və ədəbli əmir,
Ey yeganə alinəsəbli gövhər,
Ey Əhmədi məclisinin şamının şüası,
Ey qəddi əbədilik bağının sərvi,
Ey Peyğəmbər sülaləsindəki yeni yetişmiş gül,
Ey qəbul əhlinin ürəyindəki sevinc,
Ey hikmətdə dünyada əvvəlinci şəxs,
Ey surətdə kamil, zamanda tayı olmayan,
Ey kamal bürcünün parlaq payı,
Ey şərəf və cəlalın parlaq gövhəri,
Ey elmdə pak və nöqsansız,
Ey ürəklərin əsir olduğu,
Ey şəkər yağdıran təb sahibi,
Nə gözəldir nəzmin sənin, kamalın mərhəba!

(130, 277)

Bu şeir Nəvvaba öz dövründə, mühitində verilən qiymətdir. Burada bir tərəfdən onun həyatının bəzi məqamları açılırsa, digər tərəfdən müasirlərinin onun yaradıcılığına dərindən bələdliyi, bir insan kimi hansı yüksək

keyfiyyətlərə sahib olması, hansı hisslərlə yaşaması aydınlaşır. Eyni zamanda onun bəxşiş əmiri, səxavət və kəramət sahibi, ədəbli əmir, yeganə alinəsəbli gövhər olması göstərilir. Bu, onun həyatının bir başqa tərəfidir.

Onun digər tərəfində üləmalığı və şairliyi dayanır. Hikmətdə dünyada əvvəlinci, elmdə pak və nöqsansız olması vurğulanır. Eyni zamanda «nə gözəldir nəzmin» deyə müraciət edilir. Bu, bütövlükdə Mir Möhsün Nəvvabı səciyyələndirir. Onun insan, alim, şair kimi çox dəqiq qiymətləndirilməsidir. O, heç kəslə müqayisə olunmayacaq ucalıqda təqdim olunur. Bu isə son olaraq mühitdə, xalq arasında söylənilən hekayə və əhvalatlarda, onun gördüyü böyük işlərdə, ümumilikdə fəaliyyətində özünün ifadəsini tapır.

Onu da qeyd edək ki, bu müraciətlər təkcə Mirzə Həsənin dedikləri ilə yekunlaşmır. Bu tip «Məclisi-üns»ün üzvlərindən Məhəmməd Əli bəy Məxfinin, Hacı Abbas Agəhin, Məmo bəy Məmainin, Mirzə Ələsgər Növrəsin, Ismayıl bəy Daruqənin Mir Möhsün Nəvvaba ünvanladığı şeirlər var. Həmin şeirlər M.M.Nəvvabı kifayət qədər maraqlı olacaq tərzdə səciyyələndirir. Eyni zamanda M.M.Nəvvabın onlara cavabları da səmimiyyəti, bədii keyfiyyətləri ilə mühüm əhəmiyyət kəsb edir. Məsələn, «Məclisi-üns»ün üzvlərindən altı şairə bir cavabı xüsusilə diqqəti cəlb edir:

Əssalam, ey səfalı müşfiqlər,
Əssalam, ey vəfa həmməclisləri.
Əssalam, ey təcrübəli mürşidlər,
Əssalam, ey dünyanın pirmərdləri.
Sizin «Məclisi-üns»ünüz abad olsun. (130, 275)

Bütün bunlar mühitlə M.M.Nəvvab arasındakı səmimi münasibəti aşkarlayır. Onun böyük bir qismində isə şair

kimi ədəbi mühitdə nələrə qalib olması, hansı istedadın sahibliyi durur. Mir Möhsün Nəvvabın Mirzə Fatma Kaminəyə, Xurşidbanu Natəvana etdiyi müraciətlər və cavablar da bu sıradadır. Bunlar bütövlükdə həm şairin özünü, həm də mühiti səciyyələndirir və M.P. Vaqifdən, Q.Zakirdən gələn ənənənin XIX əsrin ikinci yarısında davamıdır. Bu mərhələ kifayət qədər zənginliklə görünür. Onlar özlüyündə ayrı-ayrı müraciətlərdə də aydınlıqla nəzərə çarpır. Problemi bir-birinə yarışmalar fonunda səciyyələndirmək çox azdır. Bu zəngin düşüncənin böyük bir hissəsini heca və əruz vəznində yazdığı lirik şeirlər təşkil edir. Məhz onun qəzəl, qəsidə, rübai, mürəbbiləri sözün həqiqi mənasında müəlliifn zəngin hisslər dünyasını xarakterizə edir. Qəzəllərində bu daha aydınlıqla müşahidə olunur:

Saqi, badə gətir, çək bu pərdəni (hicabı),
Od vur şeyxin və cavanın ibadətgahına.
Mey ver ki, dost kuyunun qapısı açılsın,
Ta diriltsin bu qanlı xarab ürəyi ( 130, 273).

Bu qəzəl klassik ənənədə Xaqani, Nizami, Füzuli qəzəlləri ilə birləşir. Bir növ XIX əsrdə onun davamı kimi görünür. Bu isə onun şeir zənginliyindən, geniş yaradıcılıq imkanlarına malik olması kimi xüsusiyyətlərindən irəli gəlir. Əruz vəznli şeirləri ayrıca bir tədqiqatın problemidir. Onun şeirlərindəki ruh keçici xarakter daşımır, eyni zamanda davamlı olaraq müxtəlif şeirlərində təkrarlanır. Üç aləmin ifadəsi kimi inkişafda, zənginləşmədə görünür. Sevgi hisslərində də bu belədir:

Harda onu yad etsəm, sinəm köz olur,
Vay, əgər, üzünü görsəm, daha şəhvar olur
(130, 264).

Bu rübailərində, mürəbbelərində, təcnislərində müxtəliflikə nəzərə çarpır. Sanki şairin fikirlər, duyğular aləminin zənginliyindən xəbər verir:

Halə vurub çəmənlərdə göyçəklər.
Əfşan olub üzdə qara birçəklər,
Zülflərinə sancıb əlvan çiçəklər,
Səthi-cahan gülüstana dönübdür. (130, 269)

Bütün bunlar Mir Möhsün Nəvvab şeirinin rəngarəngliyinin ifadəsidir. Eyni zamanda həm klassik, həm də xalq şeiri tərzində ənənənin davamıdır. Bu nümunələrdə şairin dini və dünyəvi hissləri özünə geniş yer tapır və bütövlükdə müxtəlif istiqamətli araşdırmaları zəruri edir. Onun yaradıcılığını ümumilikdə iki qismə bölmək olar. Birincidə azad sevgi, həqiqi eşq, əsil insan hissləri, xalq ruhu və nikbin dünyagörüşü, ikinci istiqamətdə mücərrəd duyğular, ilahi eşq hakim kəsilir. Nəvvab dünyəvi eşqi, ilahi eşqlə yanaşı tərənnüm etmişdir. Onun «Aşiq oldum nagahən bir şuxi-bipərvayə mən, Saldım axər öz-özümü bir əcəb qovqayə mən» mətləli qəzəlində dünyəvi eşq tərənnüm olunur. Aşiq canından keçməyə hazır olduğu məqamda qəzəlin sonunda maraqlı olacaq tərzdə deyir:

Çün məcazi eşqdən çəkdim əlim Nəvvab tək,
Bağladım sidqi-dil ilə rəhməti-üzmayə mən
(130, 299).

Bununla da o, ilahi eşqə tapınır. Çünki Nəvvab bütün dünyanın mahiyyətini, son olaraq qadirliyini ilahi eşqdə görür. Məlum olduğu kimi, hürufilik təliminə görə Allah kainatda, təbiətdə, insanda, əşyalarda təcəssüm tapmışdır. Sufilikdə ilahi eşq fəlsəfəsi əsas götürülür. Hürufiliyə görə, insan öz varlığında olan ilahi nuru dərk etməlidir. Bu isə onu əqli kamilliyə qovuşmağa səsləyir.

Nəvvab da belə bir əqidə yolu seçmiş və dünyəvi eşqdən az-az söhbət açsa da, bütün yaradıcılığı boyu ilahi eşqə sadiq qalmışdır. Bu barədə bir qəzəlində yazır:

Hər yerdə o nurlu üzün şüasının cilvəsi var,
Bütün dünyanı nurlandırar, qəbr evini bəzəyər.
Əgər Leylinin üzündə o nurlu üzün cilvəsi yoxdursa,
Nə üçün Məcnun şadlıqla dağı və səhranı mənzil edər?!
Əgər Sənan o nurdan və əsərdən təsir görməmişsə,
Nə üçün dini verib, xaçpərəstin vəsmini seçmişdir?!
(130,293).

Şairə görə Allahı hər yerdə – «sağər və meyxanədə, peymanə və xoşxanədə, kəbə və bütxanədə» görmək olar. «Kəbə və bütxanə bəhanəsi» Allahı axtarmaq üçündür. Amma mən ona görə evbəev Allahı axtarmıram ki, onu hər yerdə görə bilirəm, axtaranlar divanədirlər – deyir. Demək, Nəvvab ayrı-ayrı yerləri (Kəbə, bütxanə, məscid) deyil, bütövlükdə dünyanı Allahın evi sanır:

Hara getsən, görünən nuru görə bilərsən,
Harda olsan, parlaq cilvəni görə bilərsən,

Dostun üzünün əksini bir halda ki, hər yerdə görə bilərsən,
Divana deyiləm ki, mən gedəm evbəev. (130,293).

Göründüyü kimi, şair Allahı həyatda, yaşadığı mühitdə «görünən nur», «parlaq cilvə» kimi dərk edir. Bütün bunlarla yanaşı maraqlısı odur ki, Nəvvab özünün haram və halaldan azad bir fərd kimi dərk edir. Bu isə onun seyid olması ilə bağlıdır.

Nəvvab sənin həlal və haramından azaddır,
Sənin səadət dərgahının yaratdığıdır.
Hilal təqsiri sənin kərəminin təqsiri ilədir,
Yəni ki, günah üçün bundan yaxşı bəhanə yoxdur.

(130,293).

Nəvvab hər bir səbəb və nəticənin səbəbini Allahda görür, həmçinin çoxdinliliyi rədd etməklə təkallahlılıq, tək dinli olmaq təbliğ edir.

Qəmu aləmdə zahirsən, qəmu aləmdə mahirsən,
Nə müsəlmandır, nə məscid, nə kəlisabır, nə tərsadır.
Şüai-mehri-rüxün salıb Məcnun kühsara,
Ona verən zəban sənsən, bəhanə əldə Leyladır.

(130,293).

Nəvvab şəriəti təhrifdə bulunan dindarları, dilində dua, qəlbində riya gəzdirən, din pərdəsi altında hər cürə fırıldaq işlədən ruhaniləri, bir sözlə savadsız mollaları tənqid atəşinə tutur. Şair xalq içərisində təriqətçilik yayanların, məzhəb ayrı-seçkiliyi salanların əleyhinə çıxır və onları ifşa edir. Bəhram bəy Fədaiyə yazdığı şeirində şair ürək ağrısı ilə belə söyləyir:

Aralıqda itib hökmi-şəriət,
Xahişlərin eyləyirlər təriqət,
Bidət salıb, oxuyurlar həqiqət,
Bu bidəti zərbəft edər, şal edər.

Hər həftədə birisi baş qalxızır,
«Ənəlhəq»lər deyib bar-bar bağırır.
Avamları öz dininə çağırır,
«Əlif» qəddin şəriətin dal edər.

Bular salır aləmlərə qovğanı,
Təşrih edib, dağıdırlar dünyanı.
Pəst edərlər şəriəti-ğərranı,
Bu əfalı, inanma, dəccal edər. (130, 353)

Göründüyü kimi, bu şeirində Nəvvab ancaq molalardan danışır. Bəhram bəy Fədayi isə Nəvvaba yazdığı

cavab şeirində təkcə «şeytənətkanı» molla deyil. Hacı və bəyləri də tənqid atəşinə tutur:

Bir mollalar deyil şeytənət kanı,
Heç kəsdə yox müsəlmanlıq nişanı.
Hacıların bilmərrə yox imanı,
Əba-qəba ilə xəlqə al edər.

Bəylərimiz olub şürbi müdamə,
Təşxis verən yoxdur həlal-həramə.
Düşsə yolun hansı məclisi-amə,
Görərsən ki, qumari işğal edər. (130, 355)

Nəvvab elmli, savadlı insan üçün canını qurban verməyə hazır olan maarifpərvər bir şəxsiyyət kimi də diqqəti cəlb edir:

Aləmi-rəbbanı hanı yanına,
Gedib qurban edək canı-canına.
Fəda olaq əhdinə, peymanına,
Bular yəqin dəfi-qilü qal edər.

Nəvvab edər bu qövmdən əlhəzər,
Bu kəslərin kuyinə etməz güzər,
Aləmi-rəbbanını hərdəm gəzər,
Tapsa əgər fəda canü mal edər (130, 354).

M.M.Nəvvab dinə, dini elmlərə dərindən bələd şəxsiyyətlərdəndir. Bunu onun müxtəlif istiqamətli yaradıcılığında aydınlıqla görmək olur. Dindar olub, din xadimlərini tənqid etməsindən belə bir nəticəyə gəlmək olar ki, o, həqiqi din tərəfdarı, xalq adamıdır. Lakin dini hakim sinfin məqsəd və vəzifələrinə uyğunlaşdırmaq, şəxsi mənafeyi üçün istifadə etmək onun ümumbəşəri dəyərini, tərbiyəvi əhəmiyyətini əngəlləyir. Eyni zamanda mənəviyyata, mənəvi dəyərlərə zərbələr vurur. Mir Möhsün Nəvvab kimi şəxsiyyətlər isə

həmişə xalqla bir olmuşlar. Dünyaya açıq gözlə baxan, xalq və vətən qeyrəti çəkən, millətin savadlanması yolunda can yandıran, onu haqqa, ədalətə çağıran, yekdil ideyaları ilə vətən qarşısında əsil vətəndaş borclarını yerinə yetirən belə şəxsiyyətlər həmişə əbədiyaşarlıq qazanmışlar. M.M.Nəvvabın bütün fəaliyyəti boyu bu nəzərə çarpır. Onun zəngin lirikası da bu amala xidmət edir.

Nəvvab yaradıcılığında ilahi eşqlə bərabər dünyəvi eşqin də tərənnümünə rast gəlirik. Şair «Neyləyim, oldu bahar amma baharım gəlmədi» misrası ilə başlayan qəzəlində Vaqifsayağı sevgilisinin hicrindən qovrulduğunu, ahu-zarının ərşə dayandığını qeyd edib, «gülüzarım», «laləzarım», «nazlı yarım», «ahu-tatarım», «çeşmi-xumarım» ifadələri ilə həqiqi sevgilisinin vüsalını gözləyir. Bu şeir M.P.Vaqifin «Hər gedən gəlmiş, mənim ol nazlı yarım gəlməmiş» misrası ilə başlayan qəzəlini xatırladır. Nəvvabın bu qəzəli yüksək sənətkarlıq tələblərinə cavab verən, xalq ruhuna daha yaxın olan şeirlərindəndir:

Neyləyim, oldu bahar amma baharım gəlmədi,
Gül açıldı gülşən icrə, gülüzarım gəlmədi.

Qönçə tək qan oldu bağrım hicri-ruyində, nedim?
Lalə tək dağlandı sinəm, laləzarım gəlmədi.

Dağü bağa seyrə çıxmış cümlə ahuçeşmlər,
Ram idi, yaran, nədən ahu-tatarım gəlmədi?

Vədə verdi, sındırıb əhdini, oldu bivəfa,
Ərşi-əlaya dayandı ahü zarım, gəlmədi.

Bülbüli-şeyda kimi naləm tutubdur aləmi,
Sərvqədli məhcəbinim, nazlı yarım gəlmədi.

Müntəzir Nəvvabı qoymuş, leyk özü məstan gəzər,
Gözlərim yolda qoyub, çeşmi-xumarım gəlmədi.
(130, 356)

Azərbaycan ədəbiyyatında həcv yazmağın çox əski tarixi var. Bu yazılı ədəbiyyatın ilkin nümunələrinə qədər gedib çıxır. Tarixi proseslər ənənəvi olaraq XVIII-XIX əsr mühitlərində də təkrarlanır. Onun Qarabağ ədəbi mühitində yeni çalarlar qazanması aydınlıqla müşahidə olunur. Ümumiyyətlə, həcv demək XIX əsr şairlərinə xas olan xüsusiyyətdir. Bu xüsusiyyət ən çox Qarabağ ədəbi mühitində geniş yayılmışdır. Hətta Nəvvaba da siraət etmişdir. Lakin Nəvvab bu sahədə də özünəməxsus yol tutmuş, ona ictimai məna verə bilmişdir. O aşağıdakı bənd-də yüksək sənətkarlıqla tabunu effemizm ilə əvəz etmişdir:

Bular salar aləmə qovğa səsi,
Bir-birinə qarışdırır hər kəsi.
Aralıqda sınar kasıb nəsəsi,
Od yandırıb aləmi tonqal edər. (130, 354)

Həmişə böyük ideallarla yaşayan, bütövlükdə ideallara xidmət edən Nəvvab çox erkən yaşlarından mənəvi saflığa, təmizliyə, əqli kamilliyə doğru meyl göstərmiş, kamil sənətkar kimi yetişmişdir. O, gənc yaşlarında yazdığı bir şeirində deyir:

Tövbə, yarəb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə. (130, 365)

Mir Möhsün Nəvvabın şeir yaradıcılığı XIX əsr Qarabağ ədəbi mühitində göründüyü kimi maraqlı spesifik dəyərlərlə səciyyələnir və onun hansı dəyərlərlə yaşadığını aydınlaşdırır. Bu mənada onun çoxşaxəli yaradıcılıq fəaliyyəti böyük bir ədəbi məktəbdir. Bu ədəbi məktəbi aşkarlamaq, ona dəqiq qiymət vermək isə cild-cild əsərlərin

problemi müqabilindədir. Özü demişkən, «yaxşı işə nə lazım çəkmək pərdə». Mir Möhsün Nəvvab bütün yaradıcılığı boyu dini və dünyəvi düşüncədə yaşamış, digər klassiklərimiz kimi saf əqidəli türk oğlu olmuşdur.

Klassik poeziya ənənələrinin davamçısı kimi M.M. Nəvvab köhnə feodal adət-ənənələrinə qarşı çıxaraq yeni əxlaqi-tərbiyəvi fikirlər irəli sürmüş, əhalini maariflənməyə səsləmiş və bu sahədə böyük əmək sərf etmişdir. Çoxsahəli və rəngarəng yaradıcılığında bütünlüklə klassik irsə söykənən Nəvvab nəinki bədii təsvir və ifadə vasitələrinə görə, həm də janr, mövzu, ideya cəhətdən də klassik poeziyadan bəhrələnmişdir. Bütün yaradıcılığı boyu ilahi eşqə sadiq qalan Nəvvab sufi ideyaların fövqündə dayanmışdır. Klassik janrda qəzəl, növhə, fərd, çarparə, əfrad, mərsiyə, sinəzən və tövbənamələr yazmışdır.

Klassik poeziya ənənələrinə əsasən qəzəllərdə rədif qafiyələrdən istifadə qəzəlin həm zahiri gözəlliyini, həm də ifadəliliyini, ekspressivliyini artırır. Odur ki, M.M. Nəvvab da qəzəllərinin əksəriyyətində rədif qafiyələrdən istifadə etməklə klassik poeziya ənənələrinə sadiq qalmışdır:

Aşiq oldum nagəhan bir şuxi-bipərvayə mən,
Saldım axır öz-özümü bir əcəb qovqayə mən.
Şövqi-vəsli eylədi Vamiq kimi şeyda məni
Həsrət öldüm, ey diriğa, yetmədim Əzraya mən.
(130,299)

Və yaxud:

Neyləyim, oldu bahar, amma baharım gəlmədi,
Gül açıldı gülşən içrə, gülüzarım gəlmədi.
Qönçə tək qan oldu bağrım, hicri-ruyində nedim?
Lalə tək dağlandı sinəm, taləzarım gəlmədi. (130,356)

Daxili qafiyələrdən istifadə klassik ədəbiyyatda böyük ustalıq və sənətkarlıq rəmzi sayılmışdır. M.M.Nəvvab

yaradıcılığında bu xüsusiyyətə çox rast gəlinməsə də, az da olsa təsadüf edilir:

Qoyub hicranda Nəvvabın, kəsibdir taqətü tabın,
Yığıb başına əhbabın, özü sərməstü xəndandır.
(129,32)

Bədii təyin (epitet) bədii yaradıcılığın atributudur. Odur ki, Nəvvab yaradıcılığı epitetlərlə zəngin olan bir külliyyatdır:

Deyin o gül yüzə, şəhla gözə, o qönçə ləbə
Bahar bülbülüm, sal yada güləndə məni. (129,71)

Nəvvab yaradıcılığında təşbeh xüsusi yer tutur. Cünki o dövrdə bənzətmə və klassik irsə nəzirə yazmaq yaradıcılıq üsulu kimi dəbdə imiş:

Ey ləb, ləlin ləbimdə şirü şəkkər tək ləziz,
Şərbəti-abi-dəhanın abi-kövsər tək ləziz.(129, 20)

Nəvvabın təşbehləri çoxşaxəli və rəngarəngdir. O, canlı, cansız əşyalara, həmçinin dastan qəhrəmanlarının adlarına, mifik obrazlara, tarixi şəxsiyyətlərə istinad edərək təşbehlər silsiləsi yaratmışdır. Onun əsərlərində Allah, Xızır, Nuh, Süleyman, Leyli, Məcnun, Yusif, Züleyxa, Mənsur, Musa, İsa, Fərhad, Şirin, Xosrov və s. kimi klassik ədəbiyyatdan gələn ənənvi adlarla bağlı təşbehlərə tez-tez rast gəlmək olur. Hətta beş beytdən ibarət olan aşağıdakı qəzəlində hər beytdə təşbeh işlətmişdir:

Qərqi-dəryayi-qəm oldum, ey xudaya, dada yet,
Qüssədən gül tək saraldım, ey xuda, fəryada yet.

Qönçə tək qan oldu bağrım gülüstani-dəhridə,
Gül kimi pəjmürdə oldum, ey xudaya, dadə yet.

Bülbülü-şeyda kimi naləm cahanı çulğadı,
Gül cəfasın görməmiş öldüm, ey xuda, fəryada yet.

Badə vəslilə sərşar olmadım sağər kimi
Əşki xunin ilə doldum, ey xuda, dadə yet.

Bir gül üzlü yar vəslin görmədim Nəvvab tək,
Cövri-əyyar ilə soldum, ey xuda, fəryada yet.
(129,17)

Klassik poeziyada emosionallığı artırmaq üçün metaforalardan (istiarə) geniş istifadə olunur. Nəvvab da öz yaradıcılıq bacarığı tutumunda metaforalardan bəhrələnmişdir:

Xələt geyib zümrüddən ağaclar,
Ciçəklərdən boynun əyib budaqlar,
Şəbnəm düşüb təzələnib yarpaqlar,
Səthi-cahan gülüstana dönübdür.

Yelpəkləyir badü-bahar üzlərin,
Xumarlanıb yumur nərgiz gözlərin,
Şəkər kimi şirin edir gözlərin,
Səthi-cahan gülüstana dönübdür. (130, 269)

Klassik poeziyaya xas olan xüsusiyyətlərdən biri də ritorik (bədii) sualdır. Bədii sual şeirin təsir gücünü artırır, oxucu və dinləyicinin marağına səbəb olur. Bədii sual Nəvvabın şeirlərində daha çox öz əksini tapmışdır:

Nuri-rüxün aşiqlərə əhbab degilmi?!
Bayram ayı tək görməyə bitab degilmi?!
(129, 67)

Və yaxud:

O gül rüxsarına həsrət, nigara, yar olsunmu?!
Dərində məhrəmi-razin sənin əğyar olsunmu?!
(129, 72)

Bədii təsvir vasitələrindən biri də bədii təzaddır. Ədəbiyyatşünaslıqda buna antiteza da deyirlər. Bədii təzad da əsərin bədii gücünü artırır, fikri canlandırır. Nəvvabın poeziya yaradıcılığında bədii təzadın mükəmməl formalarına rast gəlirik:

Abad olu könlüm evi meyxanə görəndə,
Viran olu, həm nərkisi-məstanə görəndə. (129,64)

Və yaxud:

Gecələr əşki-qəmə qərq oluram sübhə kimi,
Sübhlər şamə təki eylərəm ahü fəryad. (129, 20)

Klassik ədəbiyyatda işlədilən və təsvir vasitələrindən olan təlmihlərdən geniş istifadə olunur. Təlmih şairin dünyagörüşünü və özündən əvvəlki bilgilərə dərindən yiyələndiyini bir daha aşkarlayır. Nəvvab yaradıcılığında da təlmihlərdən istifadə olunmuşdur:

Leyliyi-dövran sənsən, mən də Məcnuni-zaman,
Gərçi sən Şirinsən, bu kuhkəni-rüsvayə bax.
(129, 20)

Beytdə Fərhadın sadiq bir aşiq olması və eşqi yolunda Bisütun dağının çapmasına işarə edilmişdir ki, bu da təlmih adlanır.

Klassik ədəbiyyatda ən geniş şəkildə işlənən bədii ifadə vasitəsi mübaliğədir. Nəvvab bu prinsipə də sadiq qalmış və məqamında mübaliğələrdən sənətkarlıqla istifadə etmişdir:

Hicrani-yar eylədi halü dilim xərab,
Suzi-dərunim etdi cahan əhlini kəbab. (129,15)

Klassik irsə söykənən Nəvvab tarixin səhifələrində klassikləşmiş, müasir gənclik üçün ədəbi-mədəni bir örnəyə çevrilmiş və bu gün klassik sənətkarlar kimi tədqiq olunur.

# NƏTİCƏ

Bütün bunlar nəticə etibarı ilə ilk öncə onu deməyə əsas verir ki, Azərbaycan ədəbiyyatı, eləcə də onun bir hissəsi olan Qarabağ ədəbi mühiti həmişə öz zənginliyi ilə səciyyələnmişdir. Məhz, ədəbiyatımızın ayrı-ayrı dövrlərini, ayrı-ayrı dövrlərdə mövcud olan ədəbi-mədəni mühitləri araşdırmaq vasitəsi ilə ümumi ədəbiyyatımızın özünəməxsus cəhətlərini dəyərləndirmək mümkündür. Belə bir istiqamət bütövlükdə Şərq ədəbiyyatının və türk xalqları ədəbiyyatı səviyyəsini də aşkarlamağa imkan verir. Məsələn, XI-XII əsrlərdə Şirvanşahlar, Atabəylər, Qəznəvilər saraylarında formalaşan ədəbi mühitlər eyni zamanda bütövlükdə Şərq və dünya xalqları ədəbiyyatının istiqamətlərini təyin etməyə şərait yaradır. Eləcə də ondan bir qədər əvvəl Məkkə və Mədinədə olan ədəbi mühitlərin orta çağ ictimai-siyasi, ədəbi fikir tarixinə təsiri aydınlıqla görünməkdədir.

Başqa bir istiqamət, yəni orta çağların təkyə və ocaqlarının oynadığı rol da danılmazdır və böyük dəyərlərə söykənir. Əhməd Yasəvinin, Balasaqunlu Yusifin, Mahmud Kaşğarinin, Əhməd Yügnəklinin, Mövlanə Cəlaləddin Ruminin, Yunis Əmrənin bir şəxsiyyət kimi haqqında söylənilənlər, ədəbi irsindən bizə gəlib çatanlar onun bariz nümunəsidir.

Qarabağ ədəbi mühitinə gəldikdə isə bu mühit iki istiqaməti özündə qovuşdurur. Yəni həmin mühitdə arıya-ərsəyə gələn poetik nümunələr həm klassik şeir üslubunu, həm də xalq şeiri üslubunu bir vəhdət halında özündə birləşdirir.

Məhz bütün bunlar və bu kimi faktlar Qarabağ ədəbi mühitinin qədimlərə işləyən tarix və sənət damarlarıdır.

Ona görə bu mühitin araşdırılması ən başlıca olaraq çox problemləri özündə ehtiva edir.

XIX əsr Azərbaycan ədəbi mühiti ədəbi məclislərin mövcudluğu ilə səciyyələnir. Bu, Qarabağ ədəbi mühitində də belədir. «Məclisi-üns», «Məclisi-fəramuşan» öz ətrafına neçə-neçə yaradıcı adamları, şair və musiqiçiləri toplamışdır. Onların birinə X.Natəvan, digərinə M.M. Nəvvab rəhbərlik edirdi. Ədəbi məclislərin yaranması zənginləşmə, yeni dəyər qazanma demək idi. Çünki burada çox ciddi yaradıcılıq məsələləri müzakirə edilir, yeni əsərlərin yaranmasına imkan və şərait yaranırdı. Həm klassik ədəbiyyat, həm də yeni yaranan nümunələr təhlil obyektinə çevrilirdi. Bu isə inkişaf və zənginləşmə demək idi. Başqa sözlə, Qarabağ ədəbi mühiti XVIII-XIX əsrdə Azərbaycan ədəbiyyatının yaradıcılıq meyarına çevrilmişdir.

XVIII-XIX əsr Qarabağ ədəbi mühitini ənənəyə bağlılığı, təzkirəçilik ənənəsində özünü daha qabarıq göstərir. Bu, Musa Kəlimullahdan, Molla Pənah Vaqifdən Mir Möhsün Nəvvaba qədər böyük bir mərhələni təşkil edir. Burada ədəbiyyatın boy artımı, yeni deyim, ifadə çalarları qazanması aydınlıqla müşahidə olunur.

İkinci bir istiqamət və daha aparıcı görünəni isə sənət adamlarının xalq şeiri üslubunda yazıb yaratmalarıdır. Qarabağ ədəbi mühiti bu istiqamətdə daha çox dəyər kəsb etmişdir. Bunun kökləri isə çox qədimlərə gedib dayanır və xalq düşüncəsinə söykənir. Bu istiqamətin birinci tərəfini intibah faktı kimi Şah İsmayıl Xətayi və Dirili Qurban yaradıcılığı təşkil edir. Dədə Qorquddan gələn yol Qarabağın yetişdirdiyi Qurbanidə yeni təzahür formatı tapır. Onun ikinci tərəfini M.P.Vaqifin timsalında Qarabağ ədəbi mühiti təşkil edir ki, bununla bütün Azərbaycan poeziyasına yeni ruh və yeni əhvali-ruhiyyə daxil oldu.

XVIII-XIX əsrlər bir növ Qarabağ ədəbi mühitində böyük sənətkarların yetişdiyi dövrdür. Bu mühitin digər mühitlərə və digər sənətkarlara da təsiri olmuşdur. Şamaxı, Bakı, Təbriz, Dərbənd və s mühitlərlə ədəbi əlaqələr buna nümunədir. Kərbəlayi Səfi  Valeh, Abdulla Canıoğlu, Aşıq Qənbər, Aşıq Səməd, Şair Məhəmməd, Qasım bəy Zakir, Cəfərqulu xan Nəva, Məhəmməd bəy Aşiq, Aşıq Pəri, Həsən Mirzə, Xurşidbanu Natəvan və s. Onlar və onların yaratdığı ədəbi irs Qarabağ ədəbi mühitini səciyyələndirməyə tam imkan verir.

Bu mühiti xarakterizə edən istiqamətlərdən biri yuxarıda qeyd etdiyimiz kimi təzkirəçilik ənənəsidir. Məlum olduğu kimi, təzkirəçilik ənənəsi klassik ədəbiyyatın nümunəsidir. Türk və Şərq xalqlarında orta çağlardan bir istiqamət kimi maraq doğurur. İbn Qüteybədən, Əbülfərəc İsfahanidən, Məhəmməd Əvfidən, Dövlətşah Səmərqəndidən Əlişir Nəvaiyə, Sam Mirzəyə, ondan da Qarabağ ədəbi mühitindəki təzkirəçilərə böyük bir yol var. Bu yolun ən böyük faktı isə Mir Möhsün Nəvvabdır. Ümumiyyətlə, XIX əsr Azərbaycan ədəbi mühitində təzkirəçilik yeni dəyərlərlə tanınır və tədqiq edilir. M.Y. Qarabaği öz qeydlərində təzkirələri müxtəlif sənətkarların yaradıcılığını itib batmaqdan xilas etmək, gələcək nəsillərə çatdırmaq yolunda qiymətli bir mənbə hesab edir. Qarabağ ədəbi mühitinin yetişdirdiyi və bu mühitin hərtəfli bilicisi olan M.M.Nəvabın fəaliyyəti bu sırada müstəsnadır. Həmin mühiti öyrənmək üçün bir neçə ada-Mirzə Yusif Qarabağiyə, Adolf Berjeyə, Məhəmmədağa Müctəhidzadəyə, Mücrim Kərim Vardanlıya borcluyuqsa, onlardan biri də məhz M.M.Nəvvabdır. Onun çoxşaxəli yaradıcılığının mühüm bir hissəsini «Təzkireyi-Nəvvab» əsəri təşkil edir. Başqa sözlə, təzkirə M.M. Nəvvab

fəaliyyətinin zirvəsidir. O, bu fəaliyyəti ilə Qarabağ ədəbi mühitinin, bütövlükdə Azərbaycan ədəbi həyatının o dövr üçün bütöv mənzərəsini yaratmışdır. Şair, rəssam, musiqişünas, naşir, astronom və s. kimi tanınan M.M.Nəvvabın ədəbiyyat sahəsindəki xidmətləri daha böyükdür. Buna görə də həmin təzkirənin yaranması təsadüfi hadisə deyil, reallığın faktıdır.

Burada yaranan və ədəbiyyat tariximiz üçün səciyyəvi olan poetik nümunələr isə bizə M.M.Nəvvabın «Təzkireyi-Nəvvab» əsəri vasitəsi ilə gəlib çatmışdır. Bu əsər Azərbaycan, Şərq və türk xalqları kontekstində təzkirəçiliyin inkişaf hadisəsidir. Avtoqrafla təzkirə yaratmaq M.M.Nəvvaba, Qarabağ ədəbi mühitinə aid ədəbi dəlildir. Bu təzkirənin əhəmiyyəti ədəbi mühit haqqında tam təsəvvürü yaratması ilə təyin olunur. Orada yüzə yaxın Azərbaycan yazarının həyatı, yaradıcılığı haqqında məlumat verir. Eyni zamanda maraqlıdır ki, müqəddimədə müəllif, özü onun hansı dəyərlərə malik olduğunu aydınlıqla göstərir.

Qarabağ ədəbi mühiti üçün bu təzkirə əsaslı mənbədir. Burada XVIII-XIX əsrin ictimai-siyasi həyatı, fəlsəfi-əxlaqi düşüncəsi, ədəbi tənqidin mənzərəsi, digər mühitlərlə olan ədəbi əlaqələr açıqlanır. Bir faktı da vurğulayaq ki, Şamaxıdan, Gəncədən və s. ərazilərdən göndərilən ədəbi nümunələrə düzəliş verən, onu həyatla səsləşməyə istiqamətləndirən də Qarabağ ədəbi mühiti olmuşdur. Bu mühit o dövrdə ədəbi tənqidin təməl daşını qoymuş, XIX əsr Azərbaycan ədəbiyyatının formalaşmasında və inkişafında mühüm rol oynamışdır. Bu isə özlüyündə Qarabağ ədəbi mühitinin təsir dairəsini əks etdirir.

Təzkirə üçün xarakterik xüsusiyyətlərdən biri rəngarənglikdir. M.M.Nəvvab bu rəngarəngliyi gözləməklə

yanaşı, daha çox sənətkarlar arasında yazışmaları təqdim etməyə üstünlük verir. Orada M.P.Vaqifdən, M.V. Vidadidən ta öz müasirlərinə müraciətinə qədər olan çoxlu nümunələr var.

Bu təzkirə ədəbiyyat nümunəsi kimi ədəbi prosesi, ədəbi tənqidin inkişafını izləməyə əsas verirsə, digər istiqamətdə siyasi prosesi, tarixi faktları saf-çürük etməyə, dəqiqləşdirməyə şərait yaradır. Beləliklə, M.M.Nəvvabın zəngin yaradıcılığının şah əsəri olan «Təzkireyi-Nəvvab» ədəbiyyat tariximiz üçün başlıca mənbələrdəndir. Orada Qarabağ ədəbi mühitinin varlığı, mahiyyəti bütün tərəfləri ilə özünün əksini tapır və bütün Azərbaycan ədəbiyyatı üçün örnəyə çevrilir.

# İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT

1. Ağamirzadə Mir İbrahim. Şeirlər, Bakı, Şuşa, 1999, s. 3-51.

2. Ağayev Ə. 150 yaşlı Şuşa məktəbi, Bakı, Maarif, 1982, s. 3-19.

3. Ağayev Ə. Fərhad Ağazadənin pedaqoji görüşləri. Bakı, Maarif, 1987.

4. Ağayev Y. Nəvvab, «Elm və həyat» jurnalı, 1962, № 7, s. 14.

5. Ağayev Y. Nəvvab Mir Möhsün Qarabağinin musiqi terminləri, «Bakı» qəzeti, 1962, 01 fevral.

6. Ağayev Y. Nəvvab həm də rəssam idi, «Bakı» qəzeti, 1962, 07 iyun.

7. Ağayev S. Nəvvab haqqında, «Qobustan» jurnalı, 1983, № 1, s. 41-44.

8. Ağayev S. M.M.Nəvvab, «Azərbaycan» jurnalı, 1984, № 1, s. 184-185.

9. Axundov M.X. Ömürdən səhifələr. Bakı, Yazıçı, 1992, 128 s.

10. Axundov N. Qarabağ salnaməsi, Bakı, Yazıçı, 1989, 232 s.

11. Axundov N. «Kəşkül» qəzetini oxuyarkən, «Şuşa» qəzeti, 1973, 30 avqust.

12. Axundov N. Mir Möhsün Nəvvab, «Şuşa» qəzeti, 1983, 16, 19, 21, 23 iyul.

13. Axundov N. Mir Möhsün Nəvvab, «Şuşa» qəzeti, 1983, 04, 06, 09, 11, 13 avqust.

14. Axundov N. Mir Möhsün Nəvvab, «Şuşa» qəzeti, 1983, 17, 19, 22, 24 noyabr.

15. Axundov N. Mir Möhsün Nəvvab, «Şuşa» qəzeti, 1983, 06 dekabr.

16. Axundov N. Klassik irsimizdən. M.M.Nəvvab, «Azərbaycan» jurnalı, 1986, № 2, s. 172-174.

17. Allahmanlı M. Qarabağ ədəbi mühiti və Aşıq Valeh, «Elm və həyat» jurnalı, 1989, № 4, s. 17-18.

18. Allahmanlı M. XVIII əsr Qarabağ aşıq mühiti, «Azərbaycan folklorşünaslığının aktual problemləri», BDU, 1991, s. 56-57.

19. Allahmanlı M. Abdalgülablı Aşıq Valeh, «Qobustan» jurnalı, 1991, № 1, s.81-82.

20. Allahmanlı M. Aşıq Valehin həyat və yaradıcılığı, Bakı, 1990 (namizədlik dis. avtoref.), 24 s.

21. Allahmanlı M. Aşıq Valehin sənət dünyası, Bakı, V.I.Lenin adına API, 1991, 117 s.

22. ASE. X cilddə, 7-ci cild, Bakı, 1983, s. 217-218.

23. Aşıq Valeh. Alçaqlı ucalı dağlar. Bakı, Gənclik, 1970, 93 s.

24. «Avesta», Bakı, Azərnəşr, 1995, 103 s.

25. Azərbaycan ədəbiyyatı tarixi. Bakı, Azərb. SSR EA nəşriyyatı, 3 cilddə, I cild, 1960, 589 s.

26. Azərbaycan məhəbbət dastanları, Bakı, Elm, 1979, 502 s.

27. Azərbaycan yazıçılarının həyatından dəqiqələr, Bakı, Gənclik, 1971.

28. Babayev N. M.M. Nəvvabın şeir məclisində, «Şuşa» qəzeti, 1991, 02 iyul.

29. Baykara H. Azərbaycan istiqlal mübarizəsi tarixi, Bakı, Azərnəşr, 1999, s.53-60.

30. Bayramov R. Rəssam Nəvvab, «Şuşa» qəzeti, 1983, 29 yanvar.

31. Bədəlbəyli Ə. Izahlı monoqrafiya musiqi lüğəti, Bakı, Elm, 1969, s.12-174.

32. Budaqi Q, Quliyev V. M.M. Nəvvabın şeirləri, «Ədəbiyyat» qəzeti, 1992, 11 dekabr.

33. Bülbül. Seçilmiş məqalə məruzələri, Bakı, Azərnəşr, 1968, 276 s.

34. Cavanşir H. Yaddan çıxmış vətənin unudulmuş oğlu – Nəvvab, «Rezonans» qəzeti, 1997, 09-15 avnust.

35. Cəfərov N. Türk xalqları ədəbiyyatı, 3 cilddə, I cild, Bakı, Çaşıoğlu, 2006, 320 s.

36. Cəfərov N. Türk xalqları ədəbiyyatı, 3 cilddə, II cild, Bakı, Çaşıoğlu, 2006, 320 s.

37. Cəfərov N. Türk xalqları ədəbiyyatı, 3 cilddə, III cild, Bakı, Çaşıoğlu, 2007, 320 s.

38. Cəfərzadə Ə. Natəvan haqqında hekayələr, Bakı, Azərnəşr, 1963, s. 47-50. (60 s.)

39. Cəmşidov Ş. Nəvvabın yeni əlyazması necə tapıldı, «Azərbaycan müəllimi» qəzeti, 1957, 20 iyun.

40. Dadaşzadə A. Molla Pənah Vaqif, Azərnəşr, 1968, 37 s.

41. Ədəbiyyatşünaslığın əsasları. Azərbaycan Dövlət Tədris Pedaqoci Ədəbiyyat nəşriyyatı, 1963, 214 s.

42. Ədəbiyyatşünaslığın terminləri lüğəti, Bakı, Maarif, 1978, 199 s.

43. Əfəndiyev P. Azərbaycan şifahi xalq ədəbiyyatı, Bakı, Maarif, 1992, 477 s.

44. Əhmədov H. Şuşada ilk qəza məktəbi. «Azərbaycan müəllimi» qəzeti, 1967.

45. Əhmədov H., Əfəndiyev S. 150 yaşlı Şəki məktəbi. Bakı, Maarif, 1983.

46.Əliyev Ə. Mir Möhsün Nəvvab, «Laçın» qəzeti, 1990, 22 noyabr.

47. Əliyev Ə. Mir Möhsün Nəvvab və Fatma xanım Kəminə arasında müaşirə, «Şuşa» qəzeti, 1991, 25 aprel.

48. Əliyev Ə. Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvab, «Yeni dünya» qəzeti, 1995, 10 noyabr.
49. Əliyev Ə. Qarabağ ədəbi məclisləri, «Xankəndi Pedaqoji Institutu», Bakı, Səda, 2000, s. 229-230.
50. Əliyev Ə. Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın «Təzkireyi-Nəvvab» əsəri, «Pedaqoci Universitet xəbərləri», ADPU, (Humanitar, pedaqoci psixoloji elmlər seriyası) № 2, Bakı, 2002, s. 177-180.
51. Əliyev Ə. Mir Möhsün Nəvvabın çoxşaxəli fəaliyyətinin bəzi cəhətləri, Pedaqoci tədqiqatlar, (Elmi məqalələr məcmuəsi) ADPU, Bakı, 2005, s. 141-143.
52. Əliyev K. M.M. Nəvvab – 150, Qüdrətli zəka sahibi, «Sovet kəndi» qəzeti, 1983, 01 dekabr, s. 4.
53 Əliyev Z. Mir Möhsün Nəvvabın rənglər aləmi, Bakı, Azərbaycan nəşriyyatı, 1966, s. 3-15.
54. Əlizadə N., Kərimli T., Əliyev Ə. Mir Möhsün Nəvvabın əsərlərinin nəşri və tədqiqi tarixindən, Bakı, Elgün, 1997, 57 s.
55. Fətəliyev X., Kərimli T. Mir Möhsün Qarabağinin maarifçilik ideyaları. N.Tusi adına ADPU-nun xəbərləri. Pedaqogika – psixologiya fənlərinin tədrisi seriyası, Bakı, 1992, № 11, 02, s. 12-28.
56. Füzuli M. Heyrət ey büt. Bakı, Gənclik, 1989, 224 s.
57. Gəncəvi N. Bakı, Elm, 1985, 640 s.
58. Göyüşov Z. Azərbaycan maarifçilərinin əsərlərində əxlaq məsələləri, Bakı, Azərnəşr, 1964, s. 20-188.
59. Gözəl İsmayılqızı. Mir Möhsün Nəvvab (biblioqrafiya), Bakı, Nağıl evi, 2001, 108 s.
60. Hacıyev A. Ədəbiyyatşünaslığın əsasları, Bakı, ADPU, 2005, 367 s.

61. Hacıyeva A. M.M. Nəvvabın ədəbi-bədii irsi, (namizədlik dissertasiyası), 2004, 178 s.

62. Hacıbəyov Ü. Seçilmiş əsərləri, Bakı, Yazıçı, 1985, 653 s.

63. Xaqani. Seçilmiş əsərləri, Bakı, Yazıçı, 1987, 647 s.

64. Xaqani Mir Mehdi. Əsərləri, Bakı, Azərnəşr, 1989, s. 3-6.

65. Xələfov A. Azərbaycanda kitabxana işinin tarixindən. Bakı, ADU, 1963.

66. Kəminə Fatma xanım. Şeirlər, Bakı, Gənclik, 1971, s. 5-34.

67. Kərimli T. Mir Möhsün Nəvvabın pedaqoci görüşləri, Bakı, N.Tusi adına ADPU, 1995, 86 s.

68. Kərimzadə K. M.M.Nəvvabın rəsm əsərləri, «Qobustan»curnalı, 1976, №3, s. 52-54.

69. Kərimov Q. Sənət düşüncələri, Bakı, Azərbaycan Dövlət Kitab Palatası, 576 s.

70. Kərimov Q. Qurbani və poetikası, Bakı, N.Tusi adına API, 1996, 197 s.

71. Kərimzadə K. M.M.Nəvvabın rəsmləri, «Kommunist» qəzeti, 1984, 09 sentyabr.

72. Kərimov R. Farsdilli Azərbaycan poeziyası, (XIX əsrin 2-ci yarısı) Bakı, Azərbaycan nəşriyyatı, 1999, s. 8-17.

73. Kərimov R. M.M.Nəvvabın daha bir əsəri, «Qarabağ» qəzeti, 1996, 29 mart.

74. Kitabi-Dədə Qorqud, Bakı, Gənclik, 1978, 187 s.

75. Köçərli F. Azərbaycan ədəbiyyatı, 2 cilddə, I cild, Bakı, Elm, 1978, 595 s

76. Köçərli F. Azərbaycan ədəbiyyatı, 2 cilddə, II cild, Bakı, Elm, 1981

77. Qarabaği Mirzə Həsən Yüzbaşov. Seçilmiş əsərləri, «Şuşa» nəşriyyatı, 2000, 183 s.
78. Qarabaği Mirzə Yusif. Məcmueyi-Vaqif və müasirini – digər, Bakı, Şuşa, 1999, 151 s.
79. Qarayev N. Azərbaycan ədəbi məclisləri, (namizədlik dissertasiyası) Bakı, 1971, (AMEA-nın kitabxanası).
80. Qarayev N. Xurşidbanu Natəvan haqqında yeni məlumat, «Azərbaycan» jurnalı, 1962, № 8, s. 218.
81. Qarayev N. Məşədi Əyyub Baki, «Şuşa» qəzeti, 1967, 26 sentyabr.
82. Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı, Bakı, Maarif, 1966, 486 s.
83. Qayıblı G. Nəvvab və əlyazma sənəti, «Incəsənət» qəzeti, 1991, 15 oktyabr.
84. Qayıbov H.Ə. Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir. I cild. Elm, 1986, 360 s
85. Qayıbov H.Ə. Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir. II cild.1989, 320 s.
86. Qarabağnamələr. I kitab, Bakı, 1989, 155 s.
87. Qarabağnamələr. II kitab, Bakı, 1991,
88. Qazıyev A. M.M.Nəvvabın bədii yaradıcılığına dair, «Azərbaycan» jurnalı, 1974, № 7, s. 179-183.
89. Qazıyev A. M.M.Nəvvab, «Ədəbiyyat və incəsənət» qəzeti, 1968, 8 dekabr.
90. Quliyev V. Ucalığa gedən yol, Bakı, Gənclik, 1988, s. 26-60.
91. Quliyev V. Enək Isa bulağına, Bakı, Azərnəşr, 1993, s. 38-42.
92. Quliyev V. «Vətən bağı» al-əlvandır, Bakı, Azərnəşr, 1998, s. 84-176.

93. Quliyev V. «Məclisi – fəramuşan»ın unudulmuşlarından biri, «Ədəbiyyat və incəsənət» qəzeti, 1992, 8 sentyabr.
94. Quliyev V. M.M.Nəvvabın şeirləri, «Qarabağ» qəzeti, 1992, 31 dekabr.
95. Quliyev N., Kərimov R. Mir Mehdi Xəzani, «Ulduz» curnalı, 1984, № 11, s.54.
96.Qurbani. Bakı Universiteti, 1990, 280 s.
97. Qüdrətov D. Türk xalqlarının tarixi, Bakı, Kövsər, 2004, 583 s.
98. Məmmədli M. Qarabağlı Ağamirzadə Mir Möhsün Nəvvab Seyid Əhməd oğlunun mövzuları üzrə musiqi elminə aid «Vüzuhul-ərqam», «Qobustan» jurnalı, 1976, № 3, s. 48-52.
99. Məmmədov B. Xurşidbanu Natəvan, Bakı, Yazıçı, 1983, s. 18-140.
100. Məmmədov B. Natəvanın şair qohumları, Bakı, Yazıçı. 1989, s. 10-57.
101. Məmmədov G. Yusif Vəzir Çəmənzəminli, Bakı, Azərnəşr, 1987, s.36-44.
102. Məmmədov K. Qasım bəy Zakir. Bakı, Gənclik, 1984, 232 s.
103. Məmmədov K. Ensiklopedik zəka, «Kommunist» qəzeti, 1984, 30 aprel.
104. Məmmədov M., Nağıyev M. Nəvvabın nəsihətləri «Azərbaycan müəllimi» qəzeti, 1981, 10 iyul.
105. Məmmədov V. Muğam söz, ifaçı. Bakı, Işıq, 1981, s. 5-24.
106. Məmmədov V. M.M.Nəvvabın «Vüzuhul-ərqam» əsəri, «Azərbaycan gəncləri» qəzeti, 1968, 2 noyabr.
107. Məmmədov V. Bizim musiqi haqqında, «Qobustan» jurnalı, 1976, № 1, s.34.

108. Məmmədov V. Muğam, söz, ifaçı. Bakı, Işıq, 1981.

109.Mir Cəlal, Hüseynov F. XX əsr Azərbaycan ədəbiyyatı, Bakı, Maarif, 1982, 425 s.

110. Mirzə Adıgözəl bəy. Qarabağnamə. AEA. nəşri, 1950, 166 s.

111. Mirzəyeva N.Nəvvabın «Vüzuhul – ərqam» əsəri, «Elm və həyat», 1982, №2, s. 26-27.

112. Mustafayev M. Zakir şeirinin sənətkarlığı. Bakı, Yazıçı, 1983, 152 s.

113. Müctəhidzadə M. Riyazül – aşiqin, Bakı, Azərnəşr, 1995, 248 s.

114. Mümtaz S. Azərbaycan ədəbiyyatı: Q.Zakir, Bakı, Kommunast, 1925, s. 13-45.

115. Nağıyeva H. Şairin çap olunmamış bir qəzəli, «Ədəbiyyat və incəsənət» qəzeti, 1968, 27 iyul.

116. Namazəliyev Q. Musiqi mənəvi tərbiyə vasitəsidir. «Ədəbiyyat və incəsənət» qəzeti, 1979, 14 sentyabr.

117. Natəvan X. Şeirlər, Bakı, Azərnəşr, 1928, s. 66-72.

118. Natəvan X. Şeirlər, Bakı, Azərnəşr, 1956, s. 5-70.

119. Natəvan X. 33 qəzəl, Bakı, Gənclik, 1981, s. 35.

120. Natəvan X. Əsərləri, Bakı, Yazıçı, 1984, s. 78.

121. Natəvan Xurşid Banu. Əsərləri, Yazıçı, 1984, 100 s.

122. Natəvan Xurşid Banu. Şeirlər, Azərnəşr, 1938, 68 s.

123. Nəbiyev B. Firudin bəy Köçərli, Bakı, Gənclik, 1984, s.36-167.

124. Nəcəfov Ə. Nəvvabın çapçılıq fəaliyyəti, «Şuşa» qəzeti, 1983, 19 aprel.

125.Nəvvabın həyatından dəqiqələr, «Şuşa qəzeti», 1983, 19 noyabr, s. 4.

126. Nəcəfov Ə. Qarabağın ilk kitab çapçısı. «Qarabağ» qəzeti, 1991, 2 fevral.

127. Nəvvab M.M. Nəsihətnamə, Bakı, Azərbaycan nəşriyyatı, 2005, 56 s.

128. Nəvvab M.M. 1905-1906-cı illərdə erməni-müsəlman davası, Bakı, Azərbaycan nəşriyyatı, 1993, 128 s.

129. Nəvvab M.M. Divan, Bakı, Şuşa, 1999, 192 s.

130. Nəvvab M.M. Təzkireyi-Nəvvab, Bakı, Azərbaycan nəşriyyatı, 1998, 560 s.

131.Nəvvab M. M. Avropa ibtidai musiqi savadı dərsliyi. Bakı, 1995.

132. Nəvvab M.M. Vüzuhul – ərqam, Bakı, Elm, 1989, 84 s.

133. Nicat Əlisa Karvan. Seçilmiş əsərləri, Bakı, Qanun, 2000, s. 715-719.

134. Nigari S. Xaki – pakin, taci – sərim, Bakı, Azərbaycan nəşriyyatı, 2004, 366 s.

135. Növrəs Mirzə Ələsgər,Bakı, Yazıçı,1985,s.5-93.

136. Orucəli H. Ədəbiyyat və zaman, Bakı, Azərnəşr, 1971, s. 235-240.

137. Poetik məclislər, Bakı, Yazıçı, 1987, 526 s.

138.Sadıqov R. M.M.Nəvvab Qarabaği, «Şuşa» qəzeti, 1971, 24 avqust.

139 Sadıqov R. Baharın təravətli çağında, «Şuşa» qəzeti, 1980, 19 may.

140. Səfərli Ə., Yusifov X. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı, Bakı, Maarif, 1982, 385 s.

141. Səfərova Z. Nəvvab və onun «Vüzuhul – ərqam» risaləsi, Azərbaycan EA-nın xəbərləri, ədəbiyyat, dil və incəsənət seriyası, 1981, № 2, s. 95-101.

142. Səfərova Z. Qədim Azərbaycan musiqi terminləri lüğəti, Bakı, Təbriz, 1997, 53 s.

143. Səfərova Z. Azərbaycan musiqi elmi, Bakı, Elm, 1998, s. 244-245.

144. Səfərova Z. Ardı yaşanılır, Bakı, Nurlan, 2000, s. 49-95.

145. Sultanov M. Baki Qarabaği «Ədəbiyyat və incəsənət» qəzeti, 1966, 19 noyabr.

146. Şaiq Mirzə Xosrov (Axundov). M.M.Qarabaği haqqında xatirələrim, «Qobustan», 1983, № 1, s. 44-48.

147. Şah İsmayıl Xətai. Əsərləri, 2 cilddə, II cild, Bakı, Azərnəşr, 1976, 197 s.

148. Şuşinski F. Azərbaycan xalq musiqiçiləri, Bakı, Yazıçı, 1985, 478 s.

149. Şuşinski F. Hacı Hüsü, «Elm və həyat», 1963, № 10, s. 20-21.

150. Şuşinski F. Segah İslam, «Bakı» qəzeti, 1968, 15 may.

151. Şuşinski F. Segah İslam, «Ədəbiyyat və incəsənət» qəzeti, 1976, 11 dekabr.

152. Şuşinski F. Azərbaycan musiqi məclisləri, «Azərbaycan» jurnalı, 1979, № 7, s. 150-151.

153. Şuşinski F. Seyid Şuşinski, Bakı, Işıq, 1991, s. 34-35.

154. Tağıyev R. Açılmamış səhifələr. «Ədəbiyyat və incəsənət» qəzeti, 1980, 25 sentyabr.

155.Tağıyev Ə. Azərbaycanda pedaqoji fikrin inkişafı tarixindən. Bakı, 1964.

156. Alıbov Y., Axundov P. Mənalı həyat, Bakı, Gənclik, 1976, s. 21-23.

157. Talıbov Y. və b. Azərbaycanda məktəb və pedaqoji fikir tarixindən, Bakı, Ünsiyyət, 2000, s. 256-261.

158. Tərbiyət M. Danişmandani-Azərbaycan, Bakı, Azərnəşr, 1987, 464 s.

159. Topalova Aljira. Ədəbiyyat tarixinin öyrənilməsində təzkirənin rolu və Ağa Məhəmməd Müctəhidzadənin «Riyazül – aşiqin» təzkirəsi (namizədlik dissertasiyası) 2001, 124 s.

160. Tusi Xacə Nəsrəddin. «Əxlaqi – Nasir», Bakı, Elm, 1989, 254 s.

161. Vaqif M.P. Əsərləri, Azərnəşr, 1957, 248 s.

162. Vaqif M.P. Əsərləri, Azərnəşr, 1968, 280 s.

163. Vaqif M.P. Əsərləri, Yazıçı, 1988, 189 s.

164. Vəliyev V. Azərbaycan folkloru, Bakı, Maarif, 1985, 414 s.

165. Yunis Imrə. Güldəstə,Bakı, Yazıçı, 1992, 232 s.

166. Zakir Q. Əsərləri, Azərnəşr, 1953, 480 s.

167. Zakir Qasım bəy. Əsərləri Azərb. SSR EA nəşriyyatı, Bakı, 1964, 563 s.

168. Zakir Q. Seçilmiş əsərləri, Yazıçı, 1984, 384 s.

169. Zakir Q. Qoşmalar. Gənclik, 1983, 80 s.

170 Zakir Q. Mənzum hekayə və təmsillər, Gənclik, 1984, 88 s.

171.Zamanov A. Əməl dostları, Yazıçı, 1979, 370 s.

**ƏLİ UMUD oğlu ƏLİYEV**

# QARABAĞ ƏDƏBİ MÜHITİVƏ MİR MÖHSÜN NƏVVAB

**(Monoqrafiya)**

*Nəşriyyatın direktoru:* **Hüseyn Hacıyev**
*Texniki redactor:* **Gülbəniz Məmmədov**
*Dizayn:* **Müşviq Hacıyev**
*Cildçi:* **Azad Həmzəyev**
*Montajçı:* **Elmira İsmayılova**

Çapa imzalanmış **19.04.2016-cı il**
Kağız formatı **60X84 1/16**
Çap vərəqi **10**
Sifariş **129**
Sayı **200**

ADPU-nun mətbəsi
Bakı, Ü. Hacıbəyov küçəsi, 68
Tel: (+912) 493 – 74 – 10
E-mail: ADPU@Box.az



Əliyev Əli Umud oğlu 26 noyabr 1954-cü ildə Laçın rayonunun Ərikli kəndində anadan olmuşdur. 1962-ci ildə birinci sinfə daxil olub, 1972-ci ildə orta məktəbi bitirmişdir. 1972-ci ildə Xankəndi Pedaqoji İnstitutuna (Stepanakert Pedaqoji İnstitutu) daxil olub, 1976-cı ildə institutu bitirmiş. Həmin ildən Ərikli kəndində əmək fəaliyyətinə başlamışdır. On beş il orta məktəbdə ixtisası üzrə müəllim işləmişdir. 1990-cı ildə AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunda dissertant kimi qeydiyyatdan keçmişdir. "Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" əsəri" dissertasiya mövzusu kimi təsdiq olunmuşdur. 1990-cı ildən əmək fəaliyyətini N.Tusi adına ADPU-nun Şuşa filialında davam etdirmiş. Məlum Qarabağ hadisələri ilə əlaqədar əmək fəliyyətini Ağcabədi şəhərində davam etdirməli olmuşdur. İnstitutda əvvəlcə baş laborant, sonra müəllim, daha sonra baş müəllim vəzifələrində çalışmış.

"Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın "Təzkireyi- Nəvvab" əsəri" mövzusunda yazdığı dissertasiyanı filologiya üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun nəzdində fəaliyyət göstərən D.01.131-Dissertasiya Şurasında 28 mart 2012-ci il tarixdə müdafiə etmiş və təsdiqini almışdır.

O, AMİ-nin Ağcabədi filialında "Dillər, ədəbiyyat və onların tədrisi metodikası" kafedrasının müdiri vəzifəsində fəaliyyət göstərmiş, hal-hazırda ADPU-nun Ağcabədi filialında Pedaqoji fakültənin dekanıdır. İki monoqrafiya, 40-dan çox elmi-metodiki və tarixi, publisistik məqalələrin müəllifidir.

Ailəlidir, dörd övladı var.